Toplayanı, tərtib edəni
və qeydlərin müəllifi:
**Araz Yaquboğlu**
*tədqiqatçı-jurnalist,*
*Azərbaycan Jurnalistlər Birliyinin və*
*Azərbaycan Aşıqlar Birliyinin üzvü*

Redaktoru:
**Arif Məmmədli**
*şair-jurnalist,*
*Azərbaycan Jurnalistlər Birliyinin üzvü,*
*"Laçın yurdu" jurnalının baş redaktoru*

**Rəşadətli Rəşadət.**
**Bakı, "Elm və təhsil", 2023. 144 səh. (+32 səh. şəkil)**

Kitab 11 fevral 1994-cü ildə Birinci Qarabağ müharibəsi zamanı Kəlbəcər döyüşlərində şəhid olmuş Rəşadət Əli oğlu Piriyevin həyatı və döyüş yolu haqqındadır. Kitabda şəhidin haqqında müxtəlif qəzetlərdə, kitablarda çap olunan məqalələr, eləcə də komandirinin, döyüş yoldaşlarının, doğmalarının xatirələri toplanmışdır.

Kitab şəhid Rəşadət Piriyevin anadan olmasının 50 illiyi münasibətilə çap olunur.

**ISBN 978-9952-568-48-6**

## TƏRTİBÇİDƏN

Şəhidlər haqqında yazmağın özünü də şəhidlər qədər müqəddəs hesab edirəm. Təvazökarlıqdan uzaq olsa da deyim ki, bir çox şəhidlər haqqında xatirələr, bioqrafik məlumatlar yazaraq müxtəlif mətbuat orqanlarında nəşr etdirmişəm. Son belə yazılarımdan olan "Veteran babanın şəhid nəvəsi" adlı məqalədə belə bir qeydim vardı: "Şəhidlərin yubiley tədbirlərinin keçirilməsi kəndimizdə artıq ənənə halını alıb. Bu, çox yaxşı örnəkdir. Ziyadan öncə Mehdinin, Yasifin, Elçinin, Qulamın da yubileyləri qeyd olunub. Oktyabr ayının 1-də isə Rəşadətin 50 illik yubileyinin qeyd olunması nəzərdə tutulur".

Ziyanın yubileyindən həmən sonra düşündüm ki, Rəşadət haqqında da bir yazı hazırlayar, mətbuata verərəm. Bunu düşünərkən Rəşadət Piriyev haqqında 1995-ci ildə "Azadlıq" qəzetindəki müsahibə, Qədir Aslanın "Göyçə şəhidləri", Səyyad Şairovun "Yaralı Göyçə" kitablarındakı oçerklər, şair Aqşin Hacızadənin "On altı şəhidin altısı yaşıd" poeması xəyalımdan keçdi. Öz-özümə dedim: Bəlkə şəhid Rəşadət Piriyev haqqında da bir kitab hazırlayım. Çünki onun haqqında xeyli material var.

İlk olaraq fikrimi əmioğlu Aqşin Hacızadəyə söylədim. O, bu fikrimi çox alqışladı. Artıq mətbuatda olan yazıları toplamağa başladım. Həmin günlərdə şəhidin qardaşı Şahvələd Piriyev ilə də telefon əlaqəsi saxlayıb belə bir fikrimin olduğunu və mənə bəzi məlumatların, şəkillərin toplanmasında yardımçı olmasını xahiş etdim. O, da bu işi müsbət dəyərləndirib, lazımi informasiyaları və şəkilləri qısa müddətdə çatdıracağına söz verdi. Eyni zamanda şəhid Rəşadət Piriyevin bölük komandiri olmuş, həmkəndlimiz

Rizvan Qasımovdan da xahiş etdim ki, Rəşadətin xidmət etdiyi tabordakı şəxsi heyətdən kimlərin onun haqqında xatirələri varsa bizimlə bölüşsün, onları da kitaba daxil edək. Elə də oldu, hər kəs bu işə can-başla qoşuldu. Beləliklə, əlinizdə olan "Rəşadətli Rəşadət" adlı bu kitab işıq üzü gördü.

Bəri başdan mənə bu işdə yardımçı olan hər kəsə təşəkkür edir, oxucular adından minnətdarlığımı bildirirəm. Ümumən şəhidlər haqqında hər nə etsək hamılıqla bizlərin mənəvi borcu hesab edirəm. Çünki onlar dövlətçiliyimiz, ərazi bütövlüyümüz, xalqımızın öz əzəli yurdlarında firavan yaşaması naminə torpaqlarımızın işğaldan azad olunması uğrunda gedən döyüşlərdə şəhid olublar.

Kitabda Birinci Qarabağ müharibəsi zamanı Kəlbəcər döyüşlərində şəhid olmuş Rəşadət Əli oğlu Piriyevin həyatı və döyüş yolu haqqında müxtəlif qəzetlərdə, kitablarda çap olunan məqalələr, eləcə də komandirinin, döyüş yoldaşlarının, doğmalarının xatirələri toplanmışdır. Eyni zamanda kitabda şəhidin özünün və doğmalarının foto şəkilləri, həmçinin onun ata və ana tərəfinin nəsil şəcərələri də verilmişdir.

## YANŞAĞA QƏFİL DUMAN GƏLDİ...

*Jurnalist Süleyman Osmanoğlunun rota komandiri Məhəmmədəli Əmir İbrahimidən götürdüyü "Dərdini bağırmaq istəyən adam" adlı müsahibənin "Yanşağa qəfil duman gəldi..." altbaşlığından bir hissə.*

– İran-İraq müharibəsində iştirak etmişəm. Bosniyada müsəlmanlarla çiyin-çiyinə döyüşmüşəm. Boks üzrə idman ustasıyam, qızıl medal almışam. Zabitəm. Atam avtomobil qəzasında həlak olub. Üç bacım var. Cənubi Azərbaycanda yaşayırlar. 1993-cü il sentyabrın 3-də turist kimi Bakıya gəlmişdim. Fikrim burada qalıb torpaqlarımızın azadlığı uğrunda vuruşmaq idi. Elə həmin gün də Azərbaycan Respublikasının Müdafiə Nazirliyinə ərizə ilə müraciət etdim. Nazirliyin zabitlər şöbəsində məni qəbul etdilər. Söhbət zamanı hərbi təhsilim və təcrübəm olduğunu, erməni işğalçılarına qarşı könüllü döyüşmək istədiyimi bildirdim. Elə həmin gün də əmrimi verib Gəncəyə general Zaur Rzayevin rəhbərlik etdiyi hərbi hissəyə göndərdilər. Sentyabrın 5-dən hərbi qulluğa başladım. Rəfiyev məni batalyonun tərkibində bölmə komandiri təyin etdi. 1994-cü il yanvarın 13-nə qədər həmin batalyonda qulluq etdim. Biz, əsasən, hərbi hissə daxilində postlarda dayanırdıq. Çox fikir edirdim. Axı, mən postlarda dayanmaq üçün yox, döyüşmək üçün gəlmişdim. Yanvarın 13-də yenidən Müdafiə Nazirliyinə müraciət edib, döyüş batalyonlarına keçmək istədiyimi bildirdim. Əvvəlcə razı olmadılar, "Bunun üçün xüsusi əmr olmalıdır", – dedilər. Uzun təkiddən sonra nazirliyin nümayəndəsi Orucov mənim başqa batalyona keçməyimə razılıq

verdi. Həmin batalyonda məni rota komandiri təyin etdilər. 1993-cü il dekabrın 27-dən Kəlbəcər istiqamətində hücum əməliyyatı başlanmışdı. Fevralın 7-də bizim batalyon da Kəlbəcərin Yanşaq kəndi istiqamətindən döyüşə başladı. Kəndin girəcəyindəki 1-ci düşmən mövqeyini bir neçə saata ələ keçirdik. Həmin mövqeni qoruyub saxlamaq mənim rotama həvalə edildi. Ayın 10-na qədər 16 nəfər orada qaldıq. Həmin gün məni dəyişməyə gəlməli idilər. Çünki böyrəklərimdə soyuqlama vardı. Günortadan sonra Yanşağı qəfil duman bürüdü. İki-üç metr məsafəni seçmək mümkün deyildi. Birdən lap yaxın məsafədən ermənilərin səsini eşitdik. Düşmənlərin qəfil, özü də düz bizim üstümüzə gəlişi hamını çaş-baş salmışdı. Gərgin döyüş başlandı. Ermənilərlə bizi cəmi 10–15 metrlik məsafə ayırırdı. Əvvəlcə bir istiqamətdən, sonra isə sağ və sol, hətta arxa tərəfdən düşmən bizi güllə yağışına tutdu. Demək, biz mühasirəyə düşmüşdük. Atışma bir saata qədər davam etdi. Düşmən addım-addım irəliləyirdi. Birdən sanki güllə qatarının axınına düşdüm. Qarnım, sinəm, çiynim, ayağım qana boyandı. Ancaq özümü itirmədim. Ayağa qalxıb düz üstümüzə gələn quldurlara qumbaraatanla atəş açmaq istədim. Bu an ayağımdan dəyən pulemyot gülləsi məni yenidən yerə yıxdı. Sürünüb iri bir daşın arxasına keçdim. Bütövlükdə bədənimdə 12 güllə yarası vardı. Rəşadət məndən iki-üç metr aralıda döyüşürdü. Rabitə qurğusu da onda idi. Rəşadəti çağırıb rabitə qurğusunu istədim. O, mənim ən sevimli və qorxmaz əsgərim idi. Rəşadət məni qan içində gördü. Qurğunu uzadıb əlini dizimə qoydu. Mən ona uşaqlarla birgə geri çəkilməyi əmr etdim. O isə “Ölsəm də, qalsam da səninlə birgə olacağam”, – dedi. Mən yenidən onun üstünə qışqırdım, Bildirdim ki, düşmənlərin qabağını alacam, siz

geri çəkilin! Ancaq Rəşadət yerindən tərpənmədi. Rabitə ilə kömək istədim, səsimə səs verən olmadı. Qəfildən Rəşadət səndələdi. Düşmən snayperinin gülləsi onun düz ürəyinin başından dəymişdi.

Məhəmmədəlini qəfil hönkürtü boğur. Qələm yoldaşım Azər Hüseynbala bir stəkan su verir.

– Rəşadət Bərdənin Yeni Daşkəndindən idi. Ancaq bir-iki kəlmə deyə bildi: “Ax, ana, öldüm!” Düşmənlər hər tərəfdən üstümüzü alırdılar. Ələddin adlı oğlan vardı. Bərdədən. Məni dəyişməyə gəlmişdi. “Ölərəm, ancaq düşmənə əsir düşmərəm” – dedi. Sonra əlindəki qumbara ilə özünü partlatdı, qəlpələr mənə də dəydi. İsa, Mehdi də həlak oldular. Bizdən cəmi 200–300 metrlikdə əsgərlər vardı. Təchizat üzrə komandir müavini İntiqam Mirzəyev də onlarla idi. Bu dəhşətli və qeyri-bərabər döyüşdə köməyimizə gələn olmadı. Komandirimiz xəstə olduğundan onu Tahir adlı bir mayor əvəz edirdi. Ondan da bir kömək olmadı. 15 igid əsgərin hamısı şəhid oldu. Bədənimin hər yerindən qan şoralanırdı. Sonra heç nədən xəbərim olmadı...

***Süleyman Osmanoğlu.***
***“Dərdini bağırmaq istəyən adam”.***
***“Azadlıq” qəzeti, 13 may 1995-ci il, səh. 3***

# MUROVDA ŞƏHİD OLDU

Piriyev Rəşadət Əli oğlu 1973-cü ildə Bərdə rayonunun Yeni Daşkənd kəndində anadan olmuşdur. Tale elə gətirmişdir ki, onun valideynləri bir neçə il əvvəl Azərbaycana Göyçə mahalından – Basarkeçərin Daşkənd kəndindən köçüb gəlmişlər. Ancaq öz arzuları ilə yox, zorla, hiylə ilə erməni daşnaklarının xəyanəti sayəsində.

Rəşadət Göyçəli olması ilə həmişə fəxr edərdi. Söz-söhbət vurğunu idi. Şair Alqayıtın, Şiruyənin şeirlərini dinləməkdən ilham alar, aşıq Hacı və aşıq Nurəddinin telli sazları köynəkdən çıxıb "Misri", "Orta Sarıtel", "Kərəmi", "Cəlili" üstündə köklənəndə ürəyinə dağ boyda fərəh hissi dolardı. Rəşadət 1991-ci ildə[1] orta məktəbi müvəffəq qiymətlərlə başa çatdırdı. Son imtahandan sonra on il birgə oturub-durduğu məktəbli dostları ilə çay süfrəsi təşkil etdilər. Növbə ilə hərə öz ürək sözlərini dedi, gələcək arzularından danışdı. Rəşadət isə bir-iki kəlmə deməklə sözünü belə yekunlaşdırdı:

– Uşaqlar, nə qədər çalışıramsa xoş bir ifadə işlətməyə çətinlik çəkirəm. Çünki, yurdumuza xain əllər uzanıb, ermənilər quduz itə dönmüşlər. Artıq əlimiz tüfəng tutur, biz də sözümüzü deməliyik...

1991-ci ilin may ayında[2] Rəşadət əsgəri xidmətə yollandı. Əyninə əsgər paltarı geyindi. Çox keçmədən onun sədası odlu nöqtələrdən gəldi. Ağdərə bölgəsində gedən döyüşlərdə qeyrət və cəsarət göstərdi. Kəlbəcər torpağının düşmənlərdən qorunmasında onun böyük xidmətləri oldu.

---

[1] **Qeyd:** Rəşadət Piriyev 1991-ci ildə yox, 1990-cı ildə orta məktəbi bitirib.

[2] **Qeyd:** Rəşadət Piriyev 1991-ci ilin may ayında yox, 1992-ci ilin mart ayında hərbi xidmətə gedib.

Mahir topçu kimi ad-san qazandı. Dəfələrlə ölümlə üzləşdi. Lakin heç nədən qorxmadı, ən çətin anlarda daşnaklara ağır zərbələr endirdi. Onları leş-leşə söykədi.

1993-cü il avqustun 22-də[1] axşam saat 6 radələrində düşmənlər Murovdağ istiqamətində[2] zirehli texnikanın gücü ilə hücuma keçdilər. Həmin ağır döyüşdə Rəşadət bədənindən ağır güllə yarası aldı və hərbi xəstəxanaya düşdü. Hər dəqiqə, hər an onun qəlbi səngərlərdə, döyüşçü yoldaşlarının yanında idi. Elə buna görə də müalicəsi tam başa çatmamış yenidən cəbhəyə yollandı.

1994-cü il fevralın 5-i[3] Rəşadətin sön döyüşü oldu. Döyüş əməliyyatı tapşırığını yerinə yetirərkən Murovdağ bölgəsində R. Piriyevin sinəsi düşmən gülləsinə tuş gəldi və qanı Vətən torpağına qarışdı. Xoş arzuları yarımçıq qaldı Rəşadətin, dünyadan azadlıq aşiqi kimi köçdü...

***Qədir Aslan. Göyçə şəhidləri.***
***Bakı, İşıq, 1997. səh. 192–193***

---

[1] **Qeyd:** Rəşadət Piriyev avqustun 22-də yox, avqustun 21-də yaralanıb.

[2] **Qeyd:** Rəşadət Piriyev Murovdağ istiqamətində yox, Ağdam istiqamətində yaralanıb.

[3] **Qeyd:** Rəşadət Piriyev fevral ayının 5-i yox, fevral ayının 11-i şəhid olub.

## PİRİYEV RƏŞADƏT ƏLİ OĞLU

*Qələm də titrəyir, barmaqlarım da,*
*Ürəyim ağrıyır öz torpağımda.*
*Nə qədər qan axıb Qarabağımda,*
*Bu qanı sən yerdə qoyma, ay Allah!!!*

01.X.1973-cü il, payız ayının sonu[1] idi. Piriyevlər ailəsində bir oğlan uşağı dünyaya gəldi. Hamı sevindi. Evdə şənlik süfrəsi açıldı. Advermə anı çatdı, elə həmin andan təkliflər oldu, hər tərəf murğuzarlıq idi. Həqiqətən o ili əkin-biçin yaxşı oldu, insanlar bolluq içində yaşayırdılar. Elə uşağın rəngindən, əl-ayaq atmasından ona Rəşadət adı verildi.

Uşaq böyüdü, məktəb yaşı çatdı. Orta təhsilini Yeni Daşkənd kəndində başa vurdu. 1991-ci ildə[2] hərbi qulluğa çağırıldı, xidmətini Laçından başlayan Rəşadət öz cəsurluğunu göstərməyə başladı. Sonrakı döyüşləri Füzuli, Ağdam, Ağdərə rayonlarının müdafiəsində çox uğurlu oldu. 1994-cü ildə Kəlbəcərin müdafiəsi uğrunda döyüşlər gedirdi, artıq o rabitəçi idi. Döyüşçülərin dediyinə əsasən, o, 11 fevral 1994-cü ildə Yanşaq kəndinin müdafiəsi məqsədi ilə kəndə yaxınlaşanda çox qatı duman gəldi. Göz-gözü görmədi. Döyüşçülər haqqında məlumat alındı ki, həmin tarixdə 11 nəfər erməni quldurlarının mühasirəsində qalaraq əsir düşüb.

***Müəllifdən:*** Lakin o vaxtdan təxminən bir ildən artıq vaxt ötsə də ananın gözləri yolda, ürəyi həsrətdə xəbər göz-

[1] **Qeyd:** Payız ayının sonu yox, əvvəli idi.
[2] **Qeyd:** Rəşadət Piriyev 1991-ci ildə yox, 1992-ci ildə hərbi xidmətə gedib.

ləyirdi. Nə qədər soraqlandısa da bir səs çıxmadı. Mən mətbuatı izləyirdim və bir gün mənə 13 may 1995-ci ildə çıxan "Azadlıq" qəzeti gətirdilər. Səhifələri izlədim. Qəzetin 3-cü səhifəsində "Dərdini bağırmaq istəyən adam" başlığı altında gedən məqalə məni çox maraqlandırdı. Düzü, məqaləni bir neçə dəfə oxudum və nəhayət anlamağa başladım. Süleyman Osmanoğlu yazdığı "Yanşağa qəfil duman gəldi..." başlığı ilə yazılan məqalədə müsahibə götürdüyü şəxs deyir: "İran-İraq müharibəsində iştirak etmişəm, Bosniyada müsəlmanlarla çiyin-çiyinə vuruşmuşam, boks üzrə idmançıyam, qızıl medal almışam. Atam avtomobil qəzasında həlak olub, 3 bacım var. Cənubi Azərbaycanda yaşayır. Bakıya turist kimi gəlmişəm (03.IX.1993). Ancaq fikrim torpaqlarımızın azadlığı uğrunda vuruşmaqdı. Elə həmin gün Müdafiə Nazirliyinə müraciət etdim. Zabitlər şöbəsində məni qəbul etdilər. Hərbi təhsilim və təcrübəm olduğunu nəzərə alıb əmrlə məni Gəncəyə Zaur Rzayevin rəhbərlik etdiyi hərbi hissəyə göndərdilər. Sentyabrın 5-dən hərbi qulluğa başladım. Rəfiyev məni bölmə komandiri təyin etdi. Bu batalyonda xidmət etmək məni qane etmədi. 1994-cü ilin yanvarın 13-də MN müraciət etdim və döyüş batalyonlarına keçməyimi təkid etdim. Nazirliyin nümayəndəsi Orucov mənim başqa batalyona keçməyimə razılıq verdi. Həmin batalyonda məni rota komandiri təyin etdilər. Dekabrın 27-dən Kəlbəcər istiqamətində hücum əməliyyatı başlamışdı. Fevralın 7-də bizim batalyon da Kəlbəcərin Yanşaq kəndi istiqamətində döyüşə başladı. Kəndin girəcəyindəki 1-ci düşmən mövqeyini bir neçə saata ələ keçirdik və həmin mövqeni qorumaq mənim rotama həvalə edilmişdi. Ayın 10-a qədər 16 nəfər orada qaldıq. Həmin gün məni dəyişməyə gəlməli idilər, çünki böyrəklərimdə bərk ağrı

vardı. Günortadan sonra Yanşağı qəfil duman bürüdü. 2–3 metr məsafəni görmək mümkün deyildi. Birdən lap yaxın məsafədən ermənilərin səsini eşitdik. Düşmənin qəfil gəlişi hamını çaş-baş salmışdı. Gərgin döyüş başladı. Ermənilərlə bizi cəmi 10–15 metr məsafə ayırırdı. Gərgin döyüş vaxtı biz mühasirədə olduğumuzu bildik. Mən artıq 10–12 yerdən yaralanmışdım. Rəşadət məndən 2–3 metr aralıda vuruşurdu, rabitə qurğusu da onda idi. Rəşadətdən qurğunu istədim. O, mənim ən sevimli, cəsur əsgərim idi. Məni qan içində görəndə nə edəcəyini bilmədi. Mən ona uşaqlarla geri çəkilmək əmri verdim və dedim ki, ermənilərin qarşısını alacam. O, isə ölsəm də getməyəcəyəm, dedi. Bir də əmr etdim və rabitə ilə kömək istədim. Səsimə səs verən olmadı, qəfildə Rəşadət səndələdi, düşmən gülləsi onun düz ürəyinin başından dəymişdi. Məhəmmədəlini qəfil hönkürtü boğur, qələm yoldaşım Azər Hüseynbala bir stəkan su verir. Rəşadət Bərdənin Yeni Daşkənd kəndindən idi, ancaq bir iki kəlmə deyə bildi: “Ax, ana, öldüm”. Artıq düşmən hər tərəfdən üstümüzü alır. Ələddin adında oğlan vardı. Bərdədən məni dəyişməyə gəlmişdi. “Ölərəm, ancaq düşmənə əsir düşmərəm” – dedi və əlindəki qumbaranı partlatdı. Qəlpə mənə də dəydi. İsa, Mehdi də həlak oldular. Mən isə huşumu itirdim”.

Piriyev Rəşadət öz döyüş yoldaşlarını atıb geriyə çəkilmədi. Bunu hər bir Vətənini sevən mərd və cəngavər döyüşçü hərbi and içərkən deyir. Rəşadət həmin anda sadiq qalaraq əbədiyyətə qovuşdu.

Allah rəhmət eləsin!

***Səyyad Şairov. “Yaralı Göyçə”,***
***Bakı, “Nurlan”, 2006. səh. 50–53***

## RƏŞADƏT ƏLİ OĞLU PİRİYEV

Kərbəlayi Camal qızı Tərlanın nəvəsi, ailənin sonbeşiyi və Rəşidin kiçik qardaşı olan Rəşadət Əli oğlu Piriyev, hərbi komissarlıq tərəfindən həqiqi hərbi xidmətə çağrılmışdır. Elə hərbi xidmətə çağırıldığı ilk günlərdən Kəlbəcər, Laçın və sonra isə Qarabağ ərazilərində çox çətin və mürəkkəb döyüş əməliyyatlarının iştirakçısı olmuşdur. O, qeyri-adi bacarığa malik olan, həm rabitəçi operator, həm də hərbi texnikanın zərərsizləşdirilməsi üçün əməliyyatçı idi. Hələlik, rəsmi məlumatlara görə itkin sayılır. Qeyri rəsmi məlumatlara görə isə mühasirəyə düşmüş yaralı tağım komandirinin azad edilməsi zamanı, tağımın apardığı döyüş əməliyyatında qəhrəmancasına şəhid olmuşdur.

***Qocaman Qocamanov,***
***"Göyçə mahalında, Daşkənd elində",***
***Bakı, "Nurlan", 2007. səh. 23.***

## PİRİYEV RƏŞADƏT ƏLİ OĞLU

1 oktyabr 1973-cü ildə Bərdə rayonunun Yeni Daşkənd kəndində doğulmuşdur. Azərbaycanlı. Bərdə RHK-ndan Milli Orduya çağırılmışdır (11.03.1992). Sıravi əsgər. 701-ci hərbi hissənin avtomatçısı. Kəlbəcər rayonunda itkin düşmüşdür (11.02.1994).

***Azərbaycan Respublikası Xatirə Kitabı, XII cild, O, Ö, P, R. Respublika Xatirə Kitabı Redaksiyası, Bakı, 2012. səh. 208.***

## RƏŞADƏT PİRİYEV

1 oktyabr 1973-cü ildə Bərdə rayonunun Yeni Daşkənd kəndində anadan olub. 1992-ci ildə Bərdə rayon Hərbi Komissarlığı tərəfindən hərbi xidmətə çağırılıb. Elə hərbi xidmətə çox çətin və mürəkkəb döyüş əməliyyatlarının iştirakçısı olub. O, qeyri-adi bacarığa malik olan, həm rabitəçi operator, həm də hərbi texnikanın zərərsizləşdirilməsi üçün əməliyyatçı idi. Hələlik, rəsmi məlumatlara görə itkin sayılır. Qeyri-rəsmi məlumatlara görə isə mühasirəyə düşmüş yaralı tağım komandirinin azad edilməsi zamanı, tağımın apardığı döyüş əməliyyatında qəhrəmancasına şəhid olub. 11 fevral 1994-cü ildə Kəlbəcərdə şəhid olub. Məzarının yeri dəqiq məlum deyil.

***Ruslan Xəlil. Azərbaycan rabitəsinin qurucuları və davamçıları. 17 avqust, 2012 http://simsar.az/news/a-24478.html***

## PİRİYEV RƏŞADƏT ƏLİ OĞLU

1 oktyabr 1973-cü ildə Yeni Daşkənd kəndində doğulub. 1992–1994-cü illərdə 701 saylı hərbi briqadanın 5-ci taborunda xidmət edib. Ağdam, Ağdərə, Laçın, Kəlbəcər cəbhə bölgələrində vuruşub.

1993-cü ildə Ağdam uğrunda gedən döyüşlərdə qolundan yaralanıb. Lakin yarası tam sağalmamış yenidən cəbhəyə qayıdıb.

1994-cü il fevral ayının 14-də[1] Kəlbəcər uğrundakı döyüşlərdə qəhrəmancasına həlak olub. Cəsədi düşmən nəzarətindəki ərazidə qaldığından itkin sayılır. Onun son döyüşü barəsində zabit Məhəmmədəli Əmir İbrahiminin 13 may 1995-ci il tarixli "Azadlıq" qəzetində dərc olunmuş müsahibəsini qısa ixtisarla oxuculara təqdim edirik:

– "1994-cü il fevral ayının 14-də Kəlbəcərin Yanşaq istiqamətində gərgin döyüşlər başlandı[2]. Yanşağı günortadan sonra qəfil duman bürüdü. İki-üç metr irəlini seçmək mümkün deyildi. Birdən lap yaxın məsafədən ermənilərin səsini eşitdik. Düşmənlərin üstümüzə qəfil gəlişi hamını çaş-baş salmışdı. Ermənilərlə bizi cəmi 10–15 metrlik məsafə ayırırdı. Düşmən bizi sağ, sol, hətta arxa tərəfdən güllə yağışına tutdu. Biz mühasirəyə düşmüşdük. Döyüş bir saata qədər davam etdi. Qarnım, sinəm, çiynim, ayağım qana boyandı. Ayağa qalxıb qumbaraatanla atəş açmaq istədim. Bu an ayağımdan dəyən pulemyot gülləsi məni yerə sərdi. Sürünüb iri bir daşın arxasına keçdim. Bədənimdə 12 güllə yarası vardı. Rəşadət məndən iki-üç metr aralıda döyü-

---

[1] **Qeyd:** Rəşadət Piriyev fevral ayının 14-də yox, fevral ayının 11-də şəhid olub.

[2] **Qeyd:** İstinad edilən qəzetdə belə bir fakt yoxdur.

şürdü. Rabitə qurğusu da onda idi. Rəşadətdən rabitə qurğusunu istədim. Rəşadət mənim ən qorxmaz, sevimli əsgərim idi. Rəşadət məni qan içində gördü. Qurğunu uzadıb əlini dizimə qoydu. Mən ona uşaqlarla birgə geriyə çəkilməyi əmr etdim. O isə: "Ölsəm də, qalsam da səninlə birgə olacağıq", – dedi. Mən yenidən onun üstünə qışqırdım. Bildirdim ki, düşmənlərin qabağını alacam, siz geri çəkilin! Ancaq Rəşadət yerindən tərpənmədi. Rabitə ilə kömək istədim, səsimə səs verən olmadı. Qəfildən Rəşadət səndələdi. Düşmən snayperinin gülləsi onun düz ürəyinin başından dəymişdi..."

Rəşadət Əli oğlu Piriyev 21 yaşında beləcə həlak olub. Piriyevlər ailəsindən I Qarabağ müharibəsində Rəşadətin qardaşı Rəşid də iştirak edib. O, təkbaşına 9 nəfər erməni əsgərini əsir götürüb. Rəşid hazırda DİN-də məsul vəzifədə çalışır. Polis mayorudur. Yeni Daşkənd kəndində Piriyevlər ailəsinin cəsurluğu, qorxmazlığı dillər əzbəridir. Halal olsun belə oğullara Sədət ananın südü, Əli kişinin çörəyi! Onlar Rəşadət, Rəşid kimi oğullar böyüdüb tərbiyə etdikləri üçün fəxr edə bilərlər!

***Əkbər Mirzəzadə. Beşinci Bərdə taboru. (I kitab).***
***Bakı, "MTR Group", 2012. səh. 251–252***

## PİRİYEV RƏŞADƏT ƏLİ OĞLU

1 oktyabr 1973-cü ildə Bərdə rayonunun Yeni Daşkənd kəndində anadan olmuşdur. 1980–1990-cı illərdə Yeni Daşkənd kənd orta məktəbində oxumuşdur.

11 mart 1992-ci ildə Bərdə RHK tərəfindən hərbi xidmətə çağırılmışdır. N saylı hərbi hissənin atıcısı olmuş, Ağdam, Ağdərə, Laçın və Kəlbəcər rayonlarında gedən döyüş əməliyyatlarında iştirak etmişdir. 1993-cü ildə Ağdam rayonundakı döyüşdə qolundan yaralanmışdır. Bacarıqlı rabitəçi operator və hərbi texnikaların zərərsizləşdirilməsi üzrə əməliyyatçı olmuşdur.

Sıravi əsgər Rəşadət Piriyev 11 fevral 1994-cü ildə Kəlbəcər rayonunun Yanşaq kəndində şəhid olmuşdur. Məzarının yeri dəqiq məlum deyil.

Subay idi.

EL TV "Əsgər" verilişinin 2018-ci il tarixli "Şəhidlər" rubrikasında Rəşadət Piriyevin həyatı və döyüş yolu haqqında sənədli film yayımlamışdır.

Qardaşı, polis polkovnik-leytenantı Rəşid Piriyev Birinci Qarabağ müharibəsi veteranıdır.

***Araz Yaquboğlu. Daşkənddən Yeni Daşkəndə.***
***Bakı, "Elm və təhsil", 2023. səh. 265***

## “ŞƏHİDLƏR” SƏNƏDLİ FİLMİ

*Yevlax şəhərində yayımlanan televiziya kanalı EL TV-nin “Əsgər” verilişinin 20 noyabr 2017-ci il tarixli “Şəhidlər” rubrikasında Rəşadət Əli oğlu Piriyevin həyatı və döyüş yolu haqqında 24 dəqiqəlik sənədli film yayımlanmışdır.*

**Kadrarxası mətn (Elgiz Mahmudov):** Birinci Qarabağ savaşı başladığı zamanda Azərbaycanda xaos, hərcmərclik hökm sürsə də, xalqın vətənpərvər övladları heç nəyə baxmadan könüllü şəkildə döyüş bölgələrinə üz tuturdular. Qarabağın qapısı sayılan Bərdə rayonu da hazırda ən çox şəhidi, müharibə veteranı olan bölgələrimizdən biridir. Bərdənin təkcə Yeni Daşkənd kəndinin 200 nəfərə qədər sakini torpaqlarımızın azadlığı uğrunda döyüşlərdə iştirak edib. Onlardan 16 nəfəri şəhid olub. Yeni Daşkənd kəndinin vətən uğrunda qəhrəmancasına həlak olan oğullarından biri də Piriyevlər ailəsinin sonbeşiyi olan Rəşadət idi. Cəmi 20 il ömür sürsə də Rəşadətin qəhrəmanlığı bu gün də onun döyüş yoldaşlarının və komandirlərinin gözləri önündə canlanır.

Rəşadət Əli oğlu Piriyev. O, 1973-cü il oktyabrın 1-də dünyaya göz açmışdı. Mənfur ermənilərin Qarabağa iddialarının başlanması, həmvətənlərimizin öz doğma torpaqlarından didərgin düşməsi və qətlə yetirilməsi Rəşadəti də narahat edirdi. 1992-ci ildə onun böyük qardaşı Rəşid Piriyev artıq könüllü şəkildə vətənin müdafiəsində iştirak edirdi. Ürəyi vətən eşqi ilə yanan Rəşadət də qardaşından geri qalmadı. O, da vətən borcunu ödəmək üçün döyüş bölgəsinə yollanır.

**Şahmurad Piriyev (qardaşı):** Özünümüdafiə batalyonları yarananda onun özünün vətənpərvərliyindən idi ki, dedi, mən də gedirəm. Getdi, əvvəlcə 701 saylı hərbi hissədə, sonra isə Gəray Əsədovun batalyonunda xidmət elədi. O vaxt kəndimizin gənclərinin də demək olar ki, hamısı orada qulluq edirdilər.

**Gəray Əsədov (sabiq batalyon komandiri):** 1992-ci ilin noyabr ayının əvvəlləri idi. Müdafiə nazirinin əmri ilə Bərdə motoatıcı taboru yaradıldı. Laçının şimalında, yəni koridorun şimal hissəsində ağır döyüşlər gedirdi. Sol istiqamətində Qırxqız dağı, Çorman kəndi, sağ istiqamətində Hoçaz dağı, Alxaslı, Minkənd kəndi istiqamətində döyüşlər gedirdi. Hoçaz dağı ermənilərdən alınmışdı. Həmin vaxtı biz bir taboru Bərdədə tam komplektləşdirdik və Laçının şimal hissəsinə göndərildik. Dislokasiya yerimiz Laçın rayonunun Fərraş kəndi oldu. Orada mən qərargah rəisi idim. Şəxsi heyətlə tam tanışlığımız, onların mənəvi-psixoloji, döyüş hazırlığını həm də başqa hərbi keyfiyyətlərini yoxladıq. Piriyev Rəşadət Əli oğlunu mən orada tanıdım. Həmin vaxtı onun 19 yaşı vardı. Lakin 19 yaşı olmasına baxmayaraq, çətin relyef şəraitinə tez alışdı. Onu da deyim ki, qış vaxtı dağlarda çox soyuq olur. Bu baxımdan hərbi əməliyyatlar keçirmək çətinləşir. Belə ki, yolların məhdud olması, silah-sursatın, ərzağın çatışmazlığı çətinliklər yaradır. Həm də ağır döyüşlər gedirdi. Təbii ki, yüksək dağlıq şəraitdə qış vaxtı döyüşmək də çətin idi. Lakin Piriyev Rəşadət Əli oğlu elə bil ki, neçə illərin döyüşçüsü idi. Sanki bu adam illərlə belə yerlərdə döyüşlərdə iştirak eləmişdi.

Laçının Fərraş kəndində, Xankəndinin qərb hissəsində Qırxqız dağlarında biz ağır döyüşlər apardıq. Nurəddin kəndi uğrunda döyüşlərdə Rəşadət böyük şücaət göstərdi.

**Rizvan Qasımov (sabiq bölük komandiri):** Rəşadəti mən bir qəhrəman döyüşçü kimi xatırlayıram. O, mənim bölüyümdə döyüşən döyüşçülərin içində həqiqi seçilən döyüşçü, yenilməz oğlan idi. Rəşadət sözünü yerinə-yetirəniydi. Hansısa bir döyüşə gedəndə o döyüşdən qəti çəkilməzdi. Yaxud da, biz döyüşçüləri döyüşə aparanda elə olurdu ki, bir-iki dəfə döyüşdə olanı təkrar aparmaq istəmirdik ki, başqaları da getsin. Gəlib deyirdi ki, komandir, yox, mən də gedəcəm. Onun qardaşı Rəşid də başqa bir hissədə xidmət edirdi. Bunlar elə bil ki, iki qardaş rəqabət aparırdı. Həqiqətən də, ikisi də qəhrəman döyüşçülər idilər.

**Rəşid Piriyev (qardaşı):** Dağlıq Qarabağ məsələsi meydana çıxanda mən rus ordusunda xidmət edirdim. Xidməti başa vurub gəlmişdim. Təbii ki, o vaxtı hamı kimi silaha sarılmaq bizim əsas vəzifəmiz idi. Mən özüm ordudaydım. Evə gedib-gələndə baxırdım ki, bu uşaqda maraq oyanıb. İstər mənim hərbi paltar geyinməyimə, istərsə də silaha baxmağından görürdüm. Ancaq aydındı ki, o uşaq idi. Onun hələ həqiqi hərbi xidmətə çağırılma vaxtı deyildi. O dövrdə deyə bilməzdim ki, buna maraq göstərmə. Hər kəs kimliyindən asılı olmayaraq vətənin ərazi bütövlüyünü təmin etməyə qalxmalıdır. Bir vaxtı eşitdim ki, kiçik qardaşım Rəşadət də könüllü gəlib Bərdə batalyonuna yazılıb. Təbii ki, anam evdə tək idi. Bunun orduda olması mənə sərf eləmirdi. Çünki bizim elə döyüşlər olurdu ki, orada uzun müddət qalırdıq. Biz könüllü olduğumuz üçün kəşfiy-

yat qrupunda idik. Gəlirdim evdə ona bir dəfə, iki dəfə deyirdim ki, olmaz, anam evdə təkdi, sən qayıt ki, anam da tək qalmasın. Baxdım yox, bununla danışmaq qeyri-mümkündü. Həm də elə bir xarakterin yiyəsi idi ki, dediyindən dönmürdü. Gördüm təkid edir ki, xidmətə davam edəcəm. Sonra könüllülər batalyonu ləğv olunanda mən sənədlərimi Ağdərə polis şöbəsinə verdim. Döyüş bölgəsi olduğuna görə oranı seçdim. Yenə də təkid elədim ki, mən döyüşdəyəm, heç olmasa sən qal anamın yanında. Ancaq gördüm ki, onu cəbhədən saxlamaq qeyri-mümkündü.

**Kadrarxası mətn (Elgiz Mahmudov):** Rəşadət Ağdam uğrunda gedən döyüşdə bədəninin bir neçə nahiyəsindən xəsarət alır. Onu təcili Bərdə xəstəxanasına yerləşdirirlər. Lakin qardaşlarının və döyüş yoldaşlarının təkidinə baxmayaraq Rəşadət yenidən döyüş bölgəsinə yollanır.

**Gəray Əsədov (sabiq batalyon komandiri):** 15 avqust 1993-cü ildə Müdafiə nazirinin əmri ilə batalyon Ağdam istiqamətinə göndərildi. Sarıcalı, Qaraqaşlı istiqamətində yerləşdik. Orada ayın 15-də biz müdafiə rayonunu təhvil götürdük. Ayın 25-də ağır döyüşlər başladı. Yeni Daşkənddən olan Nəzərov Eldəniz və Türkməndən olan Sadiqi Ənvər şəhid oldu. Çoxlu yaralılar verdik. Yəni biz orada ermələrin 6 tankının qabağını kəsdik, geri oturtduq. İtki versək də ermənilər də böyük itki verdi. Bu döyüşdən qabaq, ayın 21-də Piriyev Rəşadət Əli oğlu minamyot atəşindən yaralandı. Yaralandığı döyüşdə Rəşadətin çox böyük rolu oldu.

**Şahvələd Piriyev (qardaşı):** Bir həftə Bərdə xəstəxanasında müalicə olundu. Müalicədən sonra da kürəyində qəlpə yarası, başında və alnında çapıqlar qalmışdı. Bir həftə müalicə götürdükdən sonra yenə də döyüşçü yoldaşlarının yanına qayıtdı. Bərdə batalyonu Kəlbəcərə gedəndə yoldaşlarının çağırışı ilə yenə də getdi. Həmin gün işdən gəldim ki, yoxdu, gedibdi.

**Şahmurad Piriyev (qardaşı):** Dörd gün burda qaldı. Dedi ki, uşaqlar Kəlbəcər uğrunda döyüşə gedirlər. Qalası deyiləm, mən də gedirəm. Gəncədə müəllimlər evi vardı. 101 deyirdilər. Mən ora yanına getdim. Mənə dedi ki, niyə gəlibsən. Biz Kəlbəcərə gedirik. Onunla son görüşüm bax onda oldu. Xatirələri bax beləcə yaddaşımda qaldı.

**Rəşid Piriyev (qardaşı):** Mən eşitdim ki, Ağdam döyüşündə yaralanıb. Gəldim baxdım ki, Bərdə xəstəxanasında yerləşdirilib. Başından, bir də kürəyindən yaralıdı. Müəyyən bir müalicə müddəti keçdi. Məndə belə bir maraq oyandı ki, bunu fikrindən daşındırım ki, bu gəlsin evdə qalsın. Həm yaralıdı, həm də müalicəsini uzun müddət evdə götürsün. Fikrim də o idi ki, anam evdə tək qalmasın. Rəşadət bunu bildi. Sonra eşitdim ki, öz başına müalicə bitməmiş evi tərk edib hərbi hissəyə gedib. Bilirdim ki, komandiri Gəray müəllim ona yaralı olduğuna görə şərait yaradır ki, kürəyində olan, çirk verən yara tam təmizlənsin, müalicə tam başa çatsın. Bu isə imkan vermirdi. Biz görüşəndə mənlə çox soyuq şəkildə görüşdü. O anı xatırlamaq mənə bir az çətindi. Mən başa saldım ki, belə eləmək olmaz. Sən tam sağalmalısan. O, mənə belə dedi: "Məni döyüş bölgəsindən çıxaran oğlanlar şəhid oldu. Sən də məni hərbidən

uzaqlaşdırmaq istəyirsən. Digər qardaşlarım nə də desə onlardan bir belə incimərəm. Axı sən döyüş görübsən. Mən də döyüşçüyəm. Yoldaşlarımdan ayrı necə qalım. Sən axı niyə belə hərəkət edirsən”. Bu sözlərdən sonra ona ümumiyyətlə ayrı söz demək istəmədim. O çox düz deyirdi. Həqiqətən də belə götürəndə hər birimiz bu torpağın oğluyuq. Nə qədər canımızda can var torpaq üçün hər şeyimizi, varımızı da, canımızı da itirməyə hazır olmalıyıq. Onu mənə dediyi bu sözlərə görə alqışladım. Dedim ki, səni Allah qorusun. Sən Kəlbəcər zonasında, mən də Ağdərədə döyüşək. Qismət Allahdan, yəqin ki, Sərsəng su anbarı alınanda siz o tərəfdən, biz də bu tərəfdən gəlib ortada görüşəcəyik.

**Rizvan Qasımov (sabiq bölük komandiri):** Ağdam uğrunda gedən döyüşlərdə, Sarıcalıda Rəşadət yaralandı. Onu rəhmətlik Eldəniz çıxartdı. Rəşadət Bərdə xəstəxanasına gətirildi. Mən özüm də xəstəxanada onun yanında oldum. Həkim dedi ki, bu əsgər təkrar döyüşə qayıtmamalıdır, tərxis olunmalıdır. Rəşadət dedi ki, həkim, mən tərxis olmayacam, xəstəxanadan birbaşa öz xidmət etdiyim hərbi hissəyə qayıdacam. Ona, “Rəşadət sən lazım olan qədər döyüşübsən, indi də yaralanmısan, tərxis olmalısan”, – desəm də qəbul etmədi. Hələ onu da dedi ki, məni yaralananda Eldəniz çıxartdı. İndi Eldəniz şəhid olub. Mən hələ düşməndən onun da qanını almalıyam.

**Kadrarxası mətn (Elgiz Mahmudov):** Rəşadətin döyüş yolu Ağdam, Laçın və Kəlbəcərin kənd və qəsəbələrinin müdafiəsində keçir. Onun döyüşlərdə göstərdiyi fədakarlıq bu gün də dillər əzbəridir.

**Camal Canbaxışov (döyüş yoldaşı):** Rəşadət yaralanandan sonra nə qədər evdən də, yoldaşlarından da dedilər ki, daha sənin xidmətə getməyin lazım deyil. Rəşadət bu yoldan çəkilmədi. Dedi bu yolu seçmişəm, bu yolla da gedəcəm. Rəşadətlə mən axırıncı dəfə 1994-cü ildə Kəlbəcərdə bir mövqedə olmuşuq.

**Gəray Əsədov (sabiq batalyon komandiri):** 1993-cü ildə məşhur Meydançay əməliyyatı həyata keçirilirdi. Bu əməliyyat kəşfiyyat-diversiya xarakteri daşıyırdı. Biz düşmənin arxasına keçməliydik. Murovdağ silsiləsi 3700 metr yüksəklikdədir. Qarlı uçurumlarla 18 saat yol gedəndən sonra biz düşmənin arxasına keçdik. Elə bir qarlı yollarla gedirdik ki, çox pis vəziyyət idi. Yəni, xırda bir sürüşmə ilə silah-sursat dərənin dibinə yumalanırdı. Hətta əsgərlər də dərəyə uça bilərdi. Piriyev Rəşadət xidmət etdiyi bölüyün tərkibində o döyüşdə iştirak elədi. Həmin kəşfiyyat xarakterli döyüşün məqsədi nə idi? Düşmənin ön xəttini müəyyən edib onlara zərbə vurmalıydıq. Zallar–Yanşaq istiqamətində biz Meydançay deyilən yerdə pusqu qurduq. Həmin pusquda Rizvan Qasımovun bölüyü iştirak elədi. Rəşadət də həmin bölüyün içindəydi. Demək olar ki, elə həmin yerdə biz düşməni pusquya saldıq. 120 nəfərlik düşmən ordusu pusquya düşdü. Ermənilərdən bircə nəfər sağ qaldı. Bizdən isə bir nəfər Kəlbəcərli – Aydınov Rəfi Telman oğlu şəhid oldu. Həmin ermənilərin məhv olunmasında Piriyev Rəşadət Əli oğlunun böyük şücaəti oldu.

**Rəşid Piriyev (qardaşı):** Mən çatdırıb onun xidmət etdiyi taborla demək olar ki, əlaqə saxlaya bilmirdim. Həm dostlarıma görə, həm də qardaşıma görə narahat idim ki,

bunlar hardadı. Hər gün irəliləyiş vardı. Doğrudan da o vaxtkı hərbi birləşmələrdə qeyri-adi ruh yüksəkliyi vardı. Hər bir əsgərin böyük vətən eşqi digərlərində ruh yüksəkliyi yaradırdı. Döyüşdən-döyüşə həvəslə gedirdilər. Vətən eşqi-alovu mən deyərdim ki, hər bir tağımda da, bölükdə də döyüşçüləri yandırırdı. Yəni heç bir əsgər ruh düşkünlüyü yaratmırdı. Çox həvəslə Azərbaycan ordusu irəli gedirdi. Erməni ordusunda nə o güc, nə də o qeyrət yoxdu ki, kiminsə torpağını ala bilsin. O xalq qan görəndə qorxan bir millətdi. Ancaq havadarlarının, rus ordusunun köməyi ilə, gücü ilə bizə həmlə edirdilər. Biz bunun dəfələrlə şahidi olurduq. Düşmənin atdığı minamyot şaxmatnı düşən kimi bilirdik ki, ruslar atır.

**Kadrarxası mətn (Elgiz Mahmudov):** 1994-cü ilin fevral ayında Kəlbəcərin Yanşaq kəndi uğrunda gedən döyüşlərdə bir nəfər rabitəçi ermənilərə əsir düşür. Rəşadət 18 nəfər kəşfiyyatçı ilə bərabər əsirlikdə olan yoldaşını xilas etmək üçün düşmən arxasına keçir. Lakin fevralın 10-dan sonra kəşfiyyatçılarla, o cümlədən Rəşadətlə əlaqə kəsilir.

**Bəxtiyar Hüsüyev (sabiq batareya komandiri):** 1994-cü il fevralın 10-u səhər saatlarında – 9–10 radələrində əsgərlərdən biri mənə yaxınlaşıb dedi ki, komandir bəlkə yemək yeyək. Dedim yox, gözləyin uşaqlar hamsı toplaşsın bir yerdə yeyərik. Bu anda qəflətən qatı bir duman gəldi. Elə bil ki, dumanı xüsusi hazırlamışdılar. Mən gördüm ki, ratsiyada kimsə bizim Azərbaycan mahnısını oxuyur: "Ay duman, gəl get bu dağlardan". Mən əsəbiləşdim. Ratsiya ilə uşaqlara dedim ki, bu mahnını kim oxuyur? Cavab gəlmə-

di. Bir andan sonra yenə də bu mahnı oxunmağa başlandı. Mən bildim ki, bu erməni təxribatçılarıdı. Bizim ondan qabaq da bir rabitəçimizi əsir götürmüşdülər. Bildim ki, bunların məlumatları var. Bizim tezliklərin şifrələri ermənilərdədir. Əmr verdim ki, tezliyi dəyişək. Mən dedim ikinci yola keçəyin. İkinci yola keçəndən sonra yenə həmin mahnı səsləndi. Nəsə bu minvalla biz tezlikləri dəyişdik. Axırda biri erməni ləhçəsi ilə cavab verdi: “Ara mulla, biz sizin tezlikləri əzbər bilirik, əlimizdədi. Özünüzü yormayın”. Həmin ərəfədə Rəşadətgil olan istiqamətdən ratsiya ilə xəbər verdilər ki, donuzlar tərpənişir. Mən başa düşdüm ki, ermənilər artıq hücuma keçiblər. Bir neçə qumbara səsi gələndən sonra atışma başladı. Mən uşaqlardan soruşdum ki, nədi, vəziyyət nətəridi. Dedilər ki, artıq donuzlar hücuma keçib. Biz də aramızda şifrəli danışırdıq. Bu zaman şiddətli bir döyüş getdi. Bir az keçmişdi gördüm ki, yaralılar var, gətirirlər. Mən bunları gətirənləri yenidən mövqeyə qayıtmağa əmr verdim. Düşmənlər sayca bizdən çox idilər. Çünki hazırlıqlı hücuma keçmişdilər. Öz havadarlarının köməyi ilə olan bir döyüş, hücum idi. Bir xeyli vaxtdan sonra bunlarla əlaqəmiz kəsildi. Dedilər ki, komandir biz artıq mühasirəyə düşdük. Əgər imkan varsa bizim mövqeyi minaatan qurğularla vurun. Mən əvvəlcə bu işi görmək istəmədim. Çünki, orada hələ sağ uşaqlar varıydı. Axırıncı dəfə ratsiya vasitəsilə danışanda bunlar bizə dedilər ki, artıq biz özümüzü partladırıq, biz əsir düşməyəcəyik. O uşaqlar düşmən əlinə sağ keçmək istəmədilər. Bir andan sonra həqiqətən də qumbara səslərini eşitdim. Sonra bizim o vaxtkı qərargah rəisi gəldi dedi ki, artıq o mövqeləri ermənilər götürdü. Oranı minaatanlardan vurmaq lazımdı ki, heç olmasa onlardan da itki olsun. Oranı o vaxta qədər bombaladıq ki,

artıq özümüzü topla vurmağa başladılar. Artıq biz məcbur qaldıq, həm də əmr oldu ki, öz mövqelərimizi dəyişək.

**Kadrarxası mətn (Elgiz Mahmudov):** Maraqlısı odur ki, Rəşadət itkin düşəndən sonra onun axtarışları bir nəticə vermir. Lakin bunula belə uzun müddətdən sonra onun qardaşı Rəşid Piriyev qəzetlərin birində gözlənilmədən itkin düşən Rəşadət haqqında məqalə dərc edildiyini görür. Onun haqqında məlumat verən şəxs isə Cənubi Azərbaycanlı, vaxtilə Rəşadətgilin batalyonunda könüllü döyüşən "Baba" ləqəbli İran vətəndaşı idi.

**Rəşid Piriyev (qardaşı):** Bir dəfə qəzetlərin birində baxdım ki, mənim qardaşım barəsində yazı var. Mən o qəzetdə göstərilən ünvana getdim. Həmin o müsahibəni alan müxbiri tapdım. Onlar Babadan müsahibəni hospitalda götürürlər. Çünki, Baba da yaralı olub. Müsahibədə jurnalist sonda belə bir söz yazmışdı: "Rəşadətin kim olduğunu biz bilmirik. Hər dəfə söhbət Rəşadətdən düşəndə qəhər onu boğur, ağlayır".

**Kadrarxası mətn (Elgiz Mahmudov):** Bu gün Rəşadətin itkin düşməsindən 23 il keçməsinə baxmayaraq ailə üzvləri hələ də onun yolunu gözləyir və geri qayıdacağına ümid edirlər.

**Şahsuvar Piriyev (qardaşı):** Birdən görürsən ki, televiziyada itkinlərlə bağlı verilişlər olur. Beynəlxalq Qızıl Xaç və Qızıl Aypara Cəmiyyətindən deyirlər ki, girovları dəyişirik. Həmin an adam özündə bir hiss keçirdir ki, bəlkə elə qardaşımın da adı çəkiləcək. Bəlkə elə bu dəyişdirilən

qardaşım olacaq. Adı eşidənə qədər adam özündə bir hiss keçirdir. Nə bilim, yenə də, Allaha pənah. Allah prezidentimizə dəyməsin. Girovlarımız dəyişdirilsin. Bizi kimi qardaşlar, atalar, analar, bacılar da sevinsin.

**Sonluq (Elgiz Mahmudov):** Biz isə öz növbəmizdə torpaqlarımızın azadlığı, xalqımızın sağ qalması, gələcəyi uğrunda döyüşən, bu yolda həlak olan və itkin düşən oğullarımızın qarşısında baş əyirik. Onlar Azərbaycan adlı bu məmləkətin tarixində və qəlbimizdə əbədi yaşayacaqlar.

***Film üzərində işləyənlər:***

| | |
|---|---|
| Müxbir: | Elgiz Mahmudov |
| Operator: | Şəban Cəfərov |
| Montaj: | Aqil Əhmədov |
| Səs operatoru: | Anar Qasımov |
| Səsləndirdi: | Elgiz Mahmudov |

***Televiziya:*** EL TV
***Tarix:*** 2017-ci il
***Çəkiliş yeri:*** Yeni Daşkənd kəndi

# “ƏSGƏR” VERİLİŞİ

*Yevlax şəhərində yayımlanan televiziya kanalı EL TV-nin “Əsgər” verilişinin 10 mart 2018-ci il tarixli “Şəhidlər” rubrikasında Yeni Daşkənd kənd orta məktəbində eyni sinifdə oxumuş altı şəhid haqqında 24 dəqiqəlik sənədli film yayımlanmışdır. Həmin filmdən Rəşadət Əli oğlu Piriyevin həyatı və döyüş yolu haqqında olan hissə.*

**Nərgiz Kərimova (aparıcı):** Vətənpərvərlik özü üçün deyil, eli üçün yaşamaqdır. Bu günü üçün deyil, gələcəyi üçün yaratmaqdır. Mən üçün deyil, bizlər üçün, xalqı üçün düşünməkdir.

Əziz tamaşaçılarımız “Əsgər” verilişi efirdədir.

Vətənpərvərlik elinə, obasına bağlılıq və bu yolda həyatını belə fəda etməyə hazır olmaq, hər kəsin cəsarəti çata biləcəyi bir əməl deyil. Lakin 1992–1994-cü illər ərzində torpaqlarımızın azadlığı və ərazi bütövlüyü uğrunda gedən döyüşlərdə göstərdikləri fədakarlıqlarla adı dillər əzbəri olan qəhrəman oğullarımız da az deyil.

“Əsgər” verilişinin bu sayında vaxtilə eyni məktəbdə və eyni sinifdə təhsil alan altı şəhid haqqında məlumat verəcəyik.

**Şeir səslənir (şeirin müəllifi: Aqşin Hacızadə):**

Vətəndi bu yurdun hər bir qarışı,
Vətəndi bu yurdun adi daşı da.
Bu vətən deyilən hər kiçik daşı,
Gərəkdir qorusun vətəndaşı da.

Savaşlar olubdu yüz illər öncə,
Tarixə düşübdü qurbanlarıyla.
Vaxt, zaman dəyişib, ötüb beləcə,
Vətən qorunubdu oğullarıyla.

Vətəni canından çox əziz sanıb,
Nə qədər igidlər, ərlər, ərənlər.
Əbədi, ölümsüz ömür qazanıb,
Özünü vətənə qurban edənlər.

**Kadrarxası mətn (Elgiz Mahmudov):** İnsanlar müxtəlif zamanlarda dünyaya gəlirlər. Hər kəsin öz taleyi və ömür yolu var. Lakin 1973-cü il təvəllüdlü Azərbaycanlı gənclərin əksəriyyətinin taleyinə müharibə iştirakçısı olmaq yazılmışdı. Həmin ildə Bərdə rayonunun Yeni Daşkənd kəndində dünyaya göz açan gənclərin taleyi də fərqli deyildi. Həmin sinfin altı nəfər şagirdi müharibədə həlak olub. Onların hər biri orta məktəbin son sinfində təhsil aldıqları vaxt erməni quldurlarının torpaqlarımıza hücumları şiddətlənmişdi. Öz dünyaları, gələcək həyatları haqqında öz fikirləri olan bu vətənpərvər gəncləri müharibənin başlanması ilə eyni məqsəd və amal birləşdirirdi: – Torpaqlarımızın müdafiəsinə qalxmaq. Və onlar belə də etdilər.

“Əsgər” verilişinin bu sayında vətən fədailərini sizə tanıtmağı özümüzə borc bildik.

**Şeir səslənir (şeirin müəllifi: Aqşin Hacızadə):**

Kiçik bir kəndidir Daşkənd yurdumun,
Bu məkan olubdur dillər əzbəri.
Adını ucaldıb Milli Ordunun,
On altı şəhidi, çoxlu ərləri.

Özümə borc bilib, çox ehtiramla
Bu şəhid ərləri yad edim dedim.
Götürüb qələmi təblə, ilhamla,
Anaraq, ruhların şad edim dedim.

**Kadrarxası mətn (Elgiz Mahmudov):** Yasif Fəzi oğlu Kərimov, Elçin Əlif oğlu Hüseynov, Rəşadət Əli oğlu Piriyev, Qulam Əkbər oğlu Qədirov, Ziya Yelmar oğlu Quliyev və Mehdi Əmirxan oğlu Məhərrəmov.[1]

*Rəşadət Əli oğlu Piriyev.* O, 1973-cü il oktyabrın 1-də dünyaya göz açmışdı. Mənfur ermənilərin Qarabağa iddialarının başlanması, həmvətənlərimizin öz doğma torpaqlarından didərgin düşməsi və qətlə yetirilməsi Rəşadəti də narahat edirdi. 1992-ci ildə onun böyük qardaşı Rəşid Piriyev artıq könüllü şəkildə vətənin müdafiəsində iştirak edirdi. Ürəyi vətən eşqi ilə yanan Rəşadət də qardaşından geri qalmadı. O, da vətən borcunu ödəmək üçün döyüş bölgəsinə yollanır. Rəşadət Ağdam uğrunda gedən döyüşlərdə bədəninin bir neçə yerindən xəsarət alır. Lakin bir qədər sağalan kimi yenidən döyüş bölgəsinə yollanır. 1994-cü ilin fevral ayında Kəlbəcərin Yanşaq kəndi uğrunda gedən döyüşlərdə bir nəfər rabitəçi ermənilərə əsir düşür. Rəşadət 18 nəfər kəşfiyyatçı ilə bərabər əsirlikdə olan yoldaşını xilas etmək üçün düşmən arxasına keçir. Lakin fevralın 10-dan sonra kəşfiyyatçılarla, o cümlədən Rəşadətlə əlaqə kəsilir. Bu gün Rəşadətin itkin düşməsindən 24 il keçməsinə baxmayaraq ailə üzvləri hələ də onun yolunu gözləyir və geri qayıdacağına ümid edirlər.

---

[1] **Qeyd:** Filmdə ardıcıllıqla altı şəhid haqqında ayrı-ayrı süjetlər verilir. Biz bu kitabda ancaq Rəşadət Əli oğlu Piriyevə aid olan hissələri nəşr edirik.

**Sonluq (Elgiz Mahmudov):** Sonda isə bir söz demək qalır. Azərbaycan adlı bir ölkənin və onun xalqının yaşaması uğrunda həyatlarını, gəncliyini fəda edən belə oğulları xatırlamaq, onları tanımaq, gənc nəsillərə tanıtmaq bu torpaqda yaşayan hər bir kəsin müqəddəs borcudur.

***Film üzərində işləyənlər:***

| | |
|---|---|
| Aparıcı: | Nərgiz Kərimova |
| Müxbir: | Rasim Salehli |
| | Elgiz Mahmudov |
| Baş redaktor: | Rəna İbrahimova |
| Redaktor: | Elgiz Mahmudov |
| Səsləndirmə: | Gülşən Aslanova |
| Baş operator: | Faiq Kərimov |
| Operatorlar: | Şəban Cəfərov |
| | Cavad Mustafazadə |
| Montaj, qrafika: | Tacəddin Dəmirov |
| Montaj: | Aqil Əhmədov |
| | Qorxmaz Şabəddinov |
| Videomühəndis: | Gülnarə Mustafayeva |
| Səs operatoru: | Anar Qasımov |
| İşıqçı: | Sahib Həşimli |
| Sürücülər: | Ramil Məmmədov |
| | Fuad Fərziyev |

***Televiziya:*** EL TV
***Tarix:*** 10 mart 2018-ci il
***Çəkiliş yeri:*** Yeni Daşkənd kəndi

**Gəray Əsədov**
*5-ci Bərdə taborunun sabiq komandiri*

## YENİLMƏZ QƏHRƏMAN

Bizim tabor Müdafiə nazirinin əmri ilə ayrıca yaradılıb. Bütün taborlar briqadaların tərkibində yaradılır. Amma bizim tabor bəlkə də yeganə tabordur ki, nazirin 370 saylı əmri ilə 25 oktyabr 1992-ci ildə yaradılıb. Tam komplektləşdirilən kimi də 701 saylı motoatıcı briqadanın sərəncamına verilməklə Laçın rayonuna göndərilib. Ondan sonra tabor onun tərkibində xidmət etməyə başladı. Xidmət müddətində Laçında sol istiqamət Fərraş, Nurəddin, Şamkənd kəndləri, Qurqun, Qırxqız dağları, sağ istiqamətində isə Hoçazdağda və Hoçazın ətəyindəki Mişni, Sonasar, Soyuqbulaq, Mayis kəndlərində müdafiə mövqeyində dayanmışdıq. Laçın və Kəlbəcər rayonlarının həm Ermənistanla dövlət sərhəddi, həm də DQMV boyunca daxili sərhəddi vardı. Laçın koridorunu da nəzərə alanda ümumi müdafiə rayonu 252 km idi. Əslində bir taborun 5 km müdafiə rayonu ola bilər. Relyefə görə briqadanın müdafiə rayonu isə bütün mühəndis-istehkam işləri ilə birlikdə 15 km-dən 30 km-ə qədər ola bilər. Bu rəqəmlərə baxdıqda aydınca görmək olar ki, müdafiə rayonunda çox çətin vəziyyət vardı. 701 saylı motoatıcı briqada Laçının şimalında dislokasiya olunmuşdu. Yəni, şimal hissəni biz və başqa qüvvələr, koridordan cənubu isə Qubadlı istiqamətindəki başqa briqadalar müdafiə edirdi. Laçının ərazisi 1835 $km^2$, Kəlbəcərin ərazisi isə 1936 $km^2$ idi. İkisi bir yerdə ümumi Dağlıq Qarabağın (4388 $km^2$) ərazisindən azca az idi. Bunları deməkdə

məqsədim odur ki, müdafiə mövqeyi bu cür və çox çətin idi.

1993-cü ilin fevral ayında ermənilər güclü hücum elədilər. Qısa müddətdə 20-dən çox kəndi götürdülər. Eyni zamanda da Ağdərə cəbhəsində Sərsəng su anbarını da götürdülər. Yeganə təminat yolu olan Tərtər–Ağdərə–Kəlbəcər yolu bağlandı. Bundan sonra təminat hava yolu ilə vertolyotlar hesabına və bir də keçilməz Murovdağ silsiləsi ilə oldu. Yollar ensiz idi, Ömər aşırımı buz bağlayırdı. Ömər aşırımından Hoçaza qədər təxminən 130–140 km yol olardı. Həm də bu yollar keçilməz idi. Bu vəziyyətdə tabor müdafiə rayonunda dayanmışdı.

Tabor Bərdədə yaranan vaxtı sıralarımızda xeyli sayda Yeni Daşkənddən olan döyüşçü vardı. Bu döyüşçülərin bir qismi "Azadlıq" batalyonunda olan haqsızlıqlara görə, bir qismi də Tərtər istiqamətində döyüşən "Qurtuluş" batalyonunun ləğv olunmasına görə bizə gəlmişdilər. Hamısı döyüş görmüş uşaqlar idi. Yeni Daşkəndli uşaqlardan Rizvan Qasımov bölük komandiri, Eldəniz Nəzərovla Tofiq Əsgərov isə tağım komandiri idi. Yəni burada çox cəsur uşaqlar var idi. Çoxluğu da dediyim kimi Yeni Daşkəndlilər təşkil edirdi. Səhv etmirəmsə Rəşadət Piriyev bizə təxminən 1993-cü ilin fevral ayının ortalarında gəldi. Rəşadət sağlam bədənli, çox enerjili, həddindən artıq döyüş duyumu olan bir oğlan idi. Hər bir çətin mövqelərə, kəşfiyyat qruplarına daim daxil edilirdi. Bir sözlə aktiv əsgər idi.

1993-cü ilin fevralında cəbhədə vəziyyət gərginləşdi. Mart ayında kuliminasiya nöqtəsinə çatdı. Martın 25-də əmr verildi ki, briqada geri çəkilir və Kəlbəcərin müdafiəsinə keçir. Briqada Laçının şimalından Kəlbəcərə qədər olan 80 km-ə qədər keçilməz yolu gəlib çatana kimi artıq

tunel tutulmuşdu. Ermənilər Kəlbəcəri işğal etmişdi. Eyni zamanda da Ağdərə istiqamətindən də Kəlbəcərə doğru erməni silahlı qüvvələri qalxırdı. Artıq briqada iki tərəfdən mühasirə vəziyyətinə düşürdü. Çaykənd–Qılınclı istiqamətində döyüşlər oldu. Burada çətinlik törədən bir məsələ də dinc əhalinin təxliyə olunması idi. Əhali də pis vəziyyətdə qalmışdı. 701 saylı motoatıcı briqadanın tərkibində 5-ci Bərdə taboru olmaqla bizim şəxsi heyyət müdafiə oluna-oluna, camaatı təxliyə edə-edə Ömər aşırımına qədər çəkildik. Qoşunun və əhalinin bir hissəsi Çopurlu–Lev istiqamətindən Daşkəsənin Alaxançallı kəndinə, qalan hissəsi də Zallar istiqamətindən Ömər aşırımına çıxaraq oradan Toğanalı kəndinə düşdülər. Yəni bu iki istiqamət üzrə həm ordu, həm də əhali geri çəkildi.

701 saylı motoatıcı briqada 4 aprel 1993-cü ildə Murovdağda müdafiə mövqeyi tutdu. Sağ istiqamət Hinaldağ, Koroğlu, Ömər, sol istiqamət Camışdağ, Murovdağ yüksəkliyi idi. Həmin döyüşlərdə tabor komandiri Tahir Cəfərov başda olmaqla 10 nəfər şəhid və itkin düşənlərimiz oldu. Sonradan itkinlərdən 2-si dəyişdirildi. Şəhid olanlardan biri də Piriyev Rəşadətin sinif yoldaşı, Yeni Daşkəndli Quliyev Ziya idi.

Biz Murovdağda olanda artıq Ağdam işğal olunmuşdu. Bərdə təhlükə altındaydı. Bizim tabor da Murovdağda müdafiə mövqeyində idi. Taboru 708 saylı motoatıcı briqadanın tərkibində olmaqla Murovdağdan Ağdam cəbhəsinə göndərdilər. Avqustun 15-də biz müdafiə rayonunu qəbul etdik və Çəmənli–Sarıcalı istiqamətində yerləşərək müdafiə mövqeyində dayandıq. Qarşımızda Şirvanlı və Qaraqaşlı yaşayış məntəqələri idi ki, ermənilər orada mövqelənmişdilər. Ermənilər həmin istiqamətdən bizim mövqeləri mütə-

madi vururdular. Demək olar ki, hər gün mövqe döyüşləri gedirdi. Avqust ayının 21-də erməni ordusu tərəfindən güclü hücum oldu. Minamyot atəşindən Piriyev Rəşadət və Cəfərov Etibar yaralandılar. Rəşadət Bərdə xəstəxanasına, Etibar isə Bakı hərbi hospitalına göndərildi. Yaralandığı döyüşdə Rəşadət çox böyük şücaət göstərdi. Belə ki, qəhrəman döyüşçü hücumu dəf edərkən yaralandı.

Avqustun 25-də səhər saat 06:00-da yenə ağır döyüşlər başladı. Düşmən 2 tank və 2 BMP-nin köməyi ilə ferma istiqamətində hücuma keçdilər. Döyüş zamanı Yeni Daşkənd kəndindən olan tağım komandiri Nəzərov Eldəniz və Türkmən kəndindən olan Sadiqi Ənvər şəhid oldu. Bölük komandiri Cəfərov Ramiz və Rzayev Elgiz ağır yaralandılar. Qasımov Nizami, Aşurov Rəmzi, Vəliyev Qismət də yaralılar içində idi. Yəni biz orada ermənilərin hücumunun qabağını çox çətinliklə də olsa kəsdik, irəliləyə bilmədilər. İtki versək də ermənilər də böyük itki verdi. Sonrakı günlərdə radiocihazlar vasitəsilə öyrəndik ki, ermənilər öz danışıqlarında yuxarı komandanlığa belə deyirlər: "Artıq biz irəli gedə bilmirik. Çox güclü müdafiə mövqeləri var. Azərbaycan ordusunu yarıb keçmək mümkün deyil". Müdafiə ona görə güclü idi ki, 10–15 gün ərzində biz xeyli mühəndis-istehkam işləri görmüşdük. Sonrakı aylarda yenə də ermənilər hücum elədi. Döyüşçülərimiz qəhrəmanlıqlar göstərdilər.

1993-cü il dekabrın 11-də əmr gəldi ki, yenidən tabor Murovdağa qayıdır. Orada ayın 29-da döyüş əmri verildi. Bu Meydançay əməliyyatı adlanırdı. Dünyaca məşhur bir əməliyyat idi. Belə ki, dünya hərb tarixində yüksək dağlıq ərazidə, qış vaxtında tək-tük əməliyyatlar olub. Onlardan 1799-cu ildə Aleksandr Suvorovun alayının Alp dağlarını

keçməyini və 1914-cü ilin sonu, 1915-ci ilin əvvəlində Ənvər paşanın həyata keçirdiyi Sarıqamış əməliyyatını misal göstərmək olar. Sarıqamış əməliyyatında çox sayda türk şəhid olmuşdur. Bunlardan sonra mənə elə gəlir ki, biz o səviyyədə olan ağır iqlim, relyef və yüksək dağ şəraitində 3462 metr yüksəklikdən keçərək Meydançay əməliyyatını yerinə yetirmişik. Sözü gedən əməliyyatda Qasımov Rizvanın bölüyü düşmən ordusunun 120 nəfərlik heyətini pusquya saldı. O əməliyyatda Piriyev Rəşadət də iştirak edirdi. Orada 100-dən çox erməni məhv edildi. Bizdən isə bir nəfər Kəlbəcərli – Aydınov Rəfi Telman oğlu şəhid oldu. Həmin ermənilərin məhv olunmasında Piriyev Rəşadət Əli oğlunun və digər əsgərlərimizin böyük şücaəti oldu. Qəhrəmanlıq göstərdilər. Bununla da 10 km cəbhə irəlilədi. Artıq müdafiə xətti Murovdağda yox Yanşaq, Zallar, Qasımbinəsinin önündə quruldu. Meydançay əməliyyatınının səhəri günü 701 saylı briqadanın komandiri polkovnik Valeh Rəfiyev ora gələrkən gördüklərini müsahibələrinin birində belə qeyd edir: “Murovdağdan Kəlbəcərə düşən yerdə o qədər çox erməni meyiti vardı ki, düşüb onları dərəyə tullamağa vaxt yox idi. Maşınla meyitlərin üstündən keçib gedirdim”.

Növbəti hücum planı hazırlanırdı. Müdafiə nazirliyinin heyəti və döyüş hazırlığı idarəsindən gəlmişdilər. Taborun döyüş hazırlığı qənaətbəxş idi. 15 yanvarda yeni döyüş əmri verildi. Biz hücuma keçərək 3054 yüksəkliyini götürdük. Bu Murovdağın cənub yamacında olan Camışdağın cənub yamacı idi. Sonra 2918, 2668 yüksəkliklərini də götürdük.

1994-cü il yanvarın 18-i 2475 yüksəkliyinə hücuma keçdik. Bu yüksəkliyə el arasında həm də Qızılqaya de-

yirlər. Döyüşdə Qasımov Rizvan yaralandı. Mən onun kiçik qardaşı Qədirov Qulamı çağırdım ki, qardaşını hospitala aparsın. Rizvanın halı özündə deyildi. Amma güclə də olsa dedi: "Qətiyyən ola bilməz, o döyüşçüdür, döyüşdə olmalıdır".

Səhəri günü, ayın 19-u biz Qızılqaya yüksəkliyini götürəndə Qədirov Qulam şəhid oldu. Bir neçə də yaralımız vardı. Qızılqaya döyüşündə də Piriyev Rəşadət fərqləndi, böyük şücaət və qəhrəmanlıq göstərdi. Sonrakı günlərdə artıq biz 2081 yüksəkliyini də götürdük. Bununla da Yanşaq, Zallar, Qasımbinəsi, Bağırlı kəndləri azad olundu. Bu əməliyyatlar haqqında mətbuatda geniş məqalələr var. İngilis Tomas Devalın, Məmməd Vəliməmmədovun da bu haqda geniş yazıları var. Təbii ki, kəşfiyyat qurumları da taborun apardığı həmin döyüşlərdən tam məlumatlı idilər. Onu da deyim ki, Qızılqaya yüksəkliyini alanda ermənilərdən 1 girov tutmaqla xəritələr ələ keçirdik. Onların 57 meyiti isə döyüş meydanında qalmışdı. Xəritələrdən sonra ermənilərin bütün artilleriyasının və digər qüvvələrinin yeri bəlli oldu. Tutduğumuz girova görə tabora 700 000 manat mükafat verildi. Müdafiə nazirinin müavini Elxan Orucov onun 100 000 manatını mənə, 100 000 manatını girovu tutan Qurbanov Feyruza (bu cəsur qəhrəman sonralar Füzuli istiqamətində şəhid oldu), qalan 500 000 manatını isə şəxsi heyətə payladı.

Azərbaycan ordusunun növbəti döyüş planı 2390 metr yüksəkliyi olan Buzluq dağını almaq idi. 1994-cü il fevralın əvvəllərində ermənilər bütün qüvvələrini Ağdaban, Çayqovuşan istiqamətinə toplamışdı. Bizdə də döyüş qabiliyyəti aşağı düşmüşdü. Çünki ərazi döyüş aparmaq üçün əlverişsiz idi. Həm də itkilərimiz də vardı. O vaxtkı Ali

Məhkəmənin həm ibtidai istintaq, həm də məhkəmə istintaq materiallarından görsənir ki, həmin vaxtı Müdafiə nazirliyinin öz verdiyi xülasəyə görə 5-ci Bərdə taborunun döyüş qabiliyyəti cəmisi 40 % qalıb. Yəni, döyüş qabiliyyətini 60 % itirib. Buna baxmayaraq yenə də əmr verdilər ki, irəli getmək lazımdır. Buzluq dağına hücum etsək də yüksəkliyi tuta bilmədik. Artıq cəbhənin sağ istiqamətində də, sol istiqamətində də ermənilər çox güclü toplanırdılar. Texnikaları da çox idi. Hətta sonralar Köçəryan yazırdı: "Biz həftələrlə Xankəndində olan qüvvələri Ağdərədən Murovun dibi ilə, gizli yollarla Ağdabana gətirdik ki, oradan Qaragöl istiqamətindən Ömər aşırımını vuraq və yolu bağlayaq". Digər bir məlumat da əldə olunmuş teleqrammada var. Orada göstərilir: "Beyləqan istiqamətində dislokasiya olunmuş 1500 nəfər, Xankəndində olan 300 nəfər və "Dizaq" cinayət qrupu Ağdaban istiqamətinə göndərilir". Təsəvvür edin, orada Ağdərə alayı, Xankəndi alayı və 3000-ə yaxın şəxsi heyət olmaqla nə qədər də texnikaları ola-ola Müdafiə nazirinin müavini Elxan Orucov radio ilə ələ keçirilən həmin məlumatı bilərəkdən mənə demir və gizli saxlayır. Və bizi də ora göndərir ki, 300 nəfərlə gedək 3000 nəfərə qarşı Buzluqda döyüşək. Qeyri-bərabər döyüş keçirilsə də Buzluğu ala bilmədik. Oraya 2 dəfə hücum etdik. Yanvarın 21-dəki döyüşdə əsgərlərimizi minamyot atəşinə tutdular. Həmin dağda Kərimov Nurlan, Əliyev Azər, Həsənov Mobil, Qubadov Rəhim, Abbasov Rasim və bir neçə nəfər də Bakıdan gələnlərdən şəhid oldular. Bunula da biz məcburən geri çəkildik. Yanvarın 27-də yenidən Qaragöl istiqamətindən Buzluğa hücum elədik. Və yenə də biz oranı ala bilmədik. Ermənilər o strateji yüksəkliyi vermək fikrində deyildilər. İkinci Qarabağ müharibə-

sində də ruslar həmən Buzluq yüksəkliyini özlərinin maraq dairəsində göstərirdilər. Oranı özləri üçün təmas xətti hesab edirdilər. Lakin “Qisas” əməliyyatı çərçivəsində 2022-ci il avqustun 3-də Buzluq dağı Azərbaycan Silahlı Qüvvələrinin nəzarətinə keçib.

5 fevral 1994-cü ildə axşam məni ağır pnevmoniya ilə qospitala apardılar. Bir müddət sonra qoşun hissələri Kəlbəcərdən çıxdı. Bundan sonrakı döyüşlərdən mənim xəbərim olmadı. Rəşadətgil necə itkin düşüblər, necə şəhid olublar, dəqiqliyi ilə bilmirəm. Amma görünən odur ki, qəhrəmanlıq göstəriblər və orada, həmin istiqamətdə Piriyev Rəşadət, Göyüşov Bayram, Ələkbərov Ələddin, Dadaşov Mehman şəhid olublar. Hətta Ələddin özünü qumbara ilə partladıb. Yəni bu qəhrəmanlıqları bunlar ediblər və şəhid olublar.

Mən Hərbi kollegiyanın 8-ci cildinə istinad edərək həmin itkin düşənlər və həlak olanlar haqqında siyahıdan Rəşadətlə bağlı hissəni oxuya bilərəm. Orada göstərilir ki, Piriyev Rəşadət Əli oğlu 11 fevral 1994-cü ildə orada itkin düşüb.

Tabor komandiri kimi deyə bilərəm ki, Piriyev Rəşadətin döyüş yolunu qısaca belə göstərmək olar: “Laçında sol istiqamətdə Fərraş, Şamkənd, Nurəddin kəndləri, Qurqun, Qırxqız dağları, sağ istiqamətdə Hoçaz dağı, Mişni, Sonasar, Soyuqbulaq, Mayis kəndləri, Minkəndə doğru, sonra Kəlbəcərin müdafiəsi, Tunel, Keçiliqaya, Əsrik, Zülfüqarlı, Comərd, Almalıq, Nadirxanlı, Qılınclı, Çaykənd, daha sonra Ağdam cəbhəsindəki Sarıcalı döyüşləri və ən nəhayət Murovdağda ermənilərin geri oturdulması”.

Mən deyərdim ki, Rəşadət çox böyük döyüş yolu keçmiş, saysız-hesabsız hərbi aktivlik göstərmişdir. O, çox

enerjili, vətənpərvər, həmişə döyüşə can atan məsuliyyətli bir əsgər, yenilməz qəhrəman idi. Gündəliyimə baxıram ki, hər yerə əmrlə Piriyev Rəşadət göndərilib. Ağdamda döyüşdə yaralandı, Kəlbəcər istiqamətində rəşadətlə döyüşdü və şəhid oldu. Doğrudan da Piriyev Rəşadət Əli oğlu elə rəşadətli oğlan idi.

Allah bütün şəhidlərimizə rəhmət eləsin.

*Bərdə, 18.08.2023*

**Cəlil İbrahimov**
*5-ci Bərdə taborunun
keçmiş qərargah rəisi, leytenant*

## ŞƏRƏFLİ BİR ÖMÜR

1993-cü ilin yanvar ayında bizim tabor Laçının Hoçaz yüksəkliyində mövqe tutmuşdu. Həmin ərəfədə başqa batalyondan bizə 4–5 nəfər döyüşçü göndərildi. Onlardan biri də rəhmətlik Piriyev Rəşadət idi. Piriyev Rəşadətin həmin günü gözümün qabağındadı. Qara əfqanka formada gəlmişdi. Tabora gələn kimi də elə birbaşa oradan da bizim mövqeyə gəldilər. Özüm də mövqedə postda dururdum. Rəşadət çox qorxmaz, soyuqqanlı əsgər idi. Gəldiyi az müddət ərzində oradakı tanıdığı və tanımadığı uşaqlarla mehriban ünsiyyət yaratdı. Laçından sonrakı vaxtlarda Kəlbəcər döyüşlərində də cəsur və igid bir döyüşçü kimi fəal iştirak elədi. Verilən əmrlərin hamısına layiqincə və yerli-yerində əməl edirdi. Hansısa əməliyyata göndəriləndə qəti ondan narahatçılıq yox idi. Çünki bütün tapşırıqları yerinə yetirən, adamı yarıdan bir əsgər kimi tanınırdı. Kəlbəcər döyüşlərində bizim tabor mühasirəyə düşmüşdü. O biznən bərabər qəhrəmanlıq göstərdi. Mühasirədən çıxa bildik.

Taborumuz yaxşı döyüş yolu keçdiyi üçün 1993-cü ilin avqust ayında Müdafiə nazirinin əmri ilə Ağdam cəbhəsinə göndərildi. Orada hər gün mövqe döyüşləri gedirdi. Piriyev Rəşadət avqust ayındakı döyüşlərin birində qolundan və kürəyindən yaralandı. Hospitala düşdü. Sağalar-sağalmaz yenə tabora qayıtdı. Dekabrın əvvəlində yenə də taboru Ağdamdan Murovdağ cəbhəsinə qaytardılar. Dekabrın 29-dan 30-na keçən gecə tabor 86 nəfərlə döyüş əmri aldı. Kəlbə-

cər istiqamətindəki Meydançayda ermənilərin arxasına keçdik. Həmin 86 nəfərdən biri də Piriyev Rəşadət idi. Orada da çox ağır döyüşlərimiz oldu. Rəşadət bu döyüşlərdə də fərqləndi. O, 1994-cü il fevral ayının əvvəlində itkin düşdü.

Piriyev Rəşadət az, amma şərəfli bir ömür yaşadı. Allah bütün şəhidlərimizə rəhmət eləsin.

*Laçın, 15.08.2023*

**Məhəmmədəli Məmmədov**
*5-ci Bərdə taborunun arxa cəbhə üzrə keçmiş komandir müavini*

## HƏKİMƏ DEDİ Kİ, QAYITMIRAM

Rəşadət bizim tabora sonradan gəlmişdi. 1992-ci ilin axırlarında Hoçazda biz onları əvəz elədik. Bizlə sona qədər bir yerdə xidmət elədi. Rəşadət qara paltar geyirdi. O formadan bizdə 2–3 nəfər geyinirdi. Başına da pilotka qoyurdu. Yəni, uşaqlardan seçilirdi. Baxırdın cavan uşaqdı, amma qorxmaz, mərd əsgərdi.

Bir müddət sonra Rəşadət Piriyev Ağdam cəbhəsində yaralanmışdı. Müalicədən sonra həkimlər onu 15 günlük evə buraxmışdılar. O evdə qalmayıb xidmətə gəlmiş, bizim tabora qoşulmuşdu. Həkim neylədi ki, get evdə qal, tam sağal sonra gələrsən. Onun bizim taborda həm kəndçiləri çox idi, həm də döyüşçü yoldaşlarından ayrı qala bilmirdi. Ona görə də həkimə dedi ki, qayıtmıram. Elə uşaqlarnan bir yerdə olacam, xidmətimə davam edəcəm.

Sonralar Rəşadət rabitə kursu keçdi və rabitəçi oldu. Rabitəçi olmağına baxmayaraq yenə də gah pulemyot, gah da avtomat götürürdü. Döyüşlərdə aktiv iştirak edirdi.

Axırıncı dəfə Rəşadət Piriyevin də olduğu dəstə Buzluqda mühasirəyə düşdülər. Rabitəsi açıq qalmışdı. Biz onun səsini eşidirdik. Rəşadət elə oradaca da şəhid oldu.

Allah şəhidlərimizə rəhmət eləsin.

*Bakı, 18.08.2023*

**İnqilab Naibov**
*5-ci Bərdə taborunun sabiq zabiti*

## RƏŞADƏTLİ ƏSGƏR

Şəhid qardaşımız Rəşadət Piriyev çox nümunəvi və Ana Vətənimizin müdafiəsi uğrunda gedən Birinci Qarabağ müharibəsində, düşmənə qarşı gedən döyüşlərdə nümunəvi bir əsgər kimi qəhrəmancasına vuruşan, öz adını sözün əsl mənasında tərənnüm edən, RƏŞADƏT NÜMUNƏLƏRİ göstərən cəsur bir döyüşçü, üzüyola, nizam-intizamlı əsgər idi. Nə vaxt baxırdın Rəşadət silahını, pal-paltarını təmizləyir. Xüsusən hər zaman onun çəkmələri parıldayar, tər-təmiz olardı. Təmizliyə çox önəm verən idi. Bu da döyüşçü üçün vacib məsələdən biridir. Rəşadət çox mehriban, gülərüz, xoşxasiyyət bir əsgər idi.

1993-cü ilin avqust ayının 25-də Ağdam rayonunun Çəmənli Sarıcalısında düşmənin çox güclü hücumunu bizim tabor dəf elədi. Sonradan bizim rabitəçilər ermənilərin danışığını dinləmişdilər. Onlar danışıqlarında etiraf edirmişlər ki, gözləmirmişlər ki, belə müdafiə olar. Çünki onlar 708 saylı briqadanı basa-basa, geri oturda-oturda gəlmişdilər. Amma bizim taborun Ağdama gəlməyindən heç onların xəbəri olmayıbmış. Fikirləşiblər ki, həmişəki kimi yenə basıb keçəcəklər. Ermənilər gördülər yox, necə deyərlər: "Daş qayaya rast gəlib". Həmin döyüşdə biz iki şəhid verdik: Nəzərov Eldəniz və Sadiqi Ənvər. Eldəniz Yeni Daşkənddən idi. Bölük komandiri Rizvan Qasımovun müavini idi. Eldəniz şümşürüy, od parçası bir oğlanıydı. Onun şəhid olmağı tabor üçün çox böyük itki oldu. Çox cəsur döyüşçü, qorxu bilməz bir insan idi. Ənvər Türkmən

kəndindən idi. Çox sakit təbiətli bir əsgər, qarayanız, arıq oğlanıydı. Allah hər ikisinə rəhmət eləsin. Həmin avqust döyüşlərində Rəşadət Piriyev, Ramiz Cəfərov, Elgiz Rzayev və başqaları yaralandılar. O şəhidlərin və yaralıların hesabına biz ermənilərin qabağını ala bildik. Ermənilər həmin hücumda düz "Dörd yol"a, yəni, Quzanlı "Dörd yol"u deyilən yerə qədər işğal etməyi planlaşdırıblarmış.

Təkrar olsa da deməliyəm ki, Rəşadət mənim yaddaşımda çox cəsur, mehriban, gülərüz, xoşxasiyyət bir əsgər kimi qalıb. Mənim ona şəxsi hörmətim vardı. Belə ki, bu hörməti Rəşadət öz davranışı, təlim-tərbiyəsi və ədəb-ərkanı ilə qazanmışdı.

Rəşadəti sonuncu dəfə 1993-cü ilin dekabr ayında Toğanada 101 adlanan qəsəbədə müvəqqəti dislokasiya olan zaman gördüm. Yaxşı yadımdadır, Bərdə rayonunun nümayəndələri və televiziyadan da çəkiliş gəlmişdi. Murovdağdan Kəlbəcər istiqamətində hücuma hazırlaşırdıq. Həmin vaxtı Rəşadətlə bərabər yaralanan uşaqların hamısı müalicədə olmalı idi. Amma ambulator müalicədə olan, yatası, hələ tam sağalmayan Rəşadəti evdə saxlaya bilməmişdilər. Deyib ki, mən səngər yoldaşlarımla bərabər xidmətimə davam etməyə gedirəm. Döyüşlər başlayanda da taborun tərkibində döyüşə qatıldı.

1994-cü ilin fevral ayında Ələkbərov Ələddin, Dadaşov Mehman, Piriyev Rəşadət və başqalarının Buzluqdakı xidmətdə olduqları mövqe ermənilər tərəfindən mühasirəyə alınmış, onlara düşmən tərəfdən uca səslə təslim olmaları haqqında təklif etmişlər. Rəşadətgil isə deyiblər ki, biz erməniyə sağ can vermərik. Son güllələrinə qədər döyüşdükdən sonra sonuncu qumbaranı partladaraq özlərini şəhid ediblər.

Rəşadət elə öz adı kimi rəşadətli əsgər idi. Allah onun və onun simasında bütün şəhidlərimizin müqəddəs ruhunu şad eləsin. Yerini Cənnət qərar versin. Necə ki, Qurani-Kərimdə Allah sübhan və-taala "Ali İmran" surəsinin 169-cu ayəsində buyurur: "Allah (haqq) yolunda, din yolunda və vətən yolunda öldürülənləri ölü hesab etməyin. Əksinə, onlar diridilər və onların ruziləri rəbbilərinin yanındadır". Həzrəti Peyğəmbərimiz Məhəmməd (s.ə.s) "Şəhidin məqamı Rəbbi yanında hömətli və məkanı əbədi olaraq Cənnətdədir" – deyə buyurmuşdur.

Xatirələri bizim üçün əziz olan bütün şəhidlərin hamısının ruhuna Allah sübhan və-taaladan onlara rəhmət diləyirəm! Onların əziz ruhları qarşısında baş əyirəm. Allah ruhlarını şad eləsin.

*Moskva, 18.08.2023*

**Rizvan Qasımov**
*Sabiq bölük komandiri,*
*II qrup Qarabağ müharibəsi əlili*

## O, MƏRD VƏ CƏSARƏTLİ OĞLAN İDİ

Biz 1992-ci ilin noyabr ayının 7-də N saylı hərbi hissənin tərkibində 5-ci Bərdə taboru olaraq ilk dəfə Laçın bölgəsinə döyüşlərə getmişik. Bizdən əvvəl orada 10 "A" saylı taborun şəxsi heyəti Laçının müdafiəsi üçün döyüşmüşdü. İndi biz onları əvəz etmək üçün göndərilmişdik. Qeyd edim ki, bu tabor da bizim hərbi hissə komandanlığına tabe idi. Biz oraya çatdıqdan bir gün sonra postların yerdəyişməsi zamanı təsadüfən orada xidmət edən həmkəndlim əsgər Rəşadət Piriyevlə rastlaşdım. O zaman biz hər ikimiz bu təsadüfi görüşdən çox sevinərək bir-birimizlə səmimi görüşüb hal-əhval etmişdik. Qısa söhbətimizdən öyrənmişdim ki, Rəşadətgilin hərbi hissəsi artıq aylardır ki, Laçının müdafiəsi uğrunda döyüşlərin iştirakçısıdır. Rəşadət həqiqi hərbi xidmətə çağırıldıqdan və Bakıda karantin dövrünü keçəndən sonra onu N saylı hərbi hissənin tərkibində Laçına gətiriblərmiş. Mən onunla söhbət edərkən onun yanında, ona yaxın olan 4–5 əsgər də vardı. Əllərini də bir-birilərinin çiyninə qoyaraq çox mehriban şəkildə bizim söhbətimizi dinləyirdilər. Mən buraya bələd olmadığım üçün onlardan Laçındakı vəziyyət haqqında soruşdum. Onlar mənə oradakı döyüşlərdən danışdılar. Sual etdim ki, nə kimi döyüşlər keçibsiniz. Dağlıq ərazi olduğundan bəzi incəliklər mənə maraqlı idi. Onlar dedilər ki, Laçının hər dağı, hər qayası bir səngərdi, hər qarışı həm bizim üçün, həm düşmənlər üçün təhlükəlidi. Odur ki, Laçın ərazisində bütün döyüş-

lərimiz bizim üçün bir tarixdi. Əsasən də Hoçaz dağında, Sarıbaba yüksəkliyində, eyni zamanda Ermənistanla sərhəd ərazilərimizdə döyüşlərimiz çox gərgin olub. Rəşadət onu da qeyd etdi ki, burada döyüşlər ağır olduğu kimi, məkan və hava şəraiti də çox ağırdır. Düşmən gülləsindən qorunmaqla bərabər, gərəkdir ki, özünüzü soyuqdan, donvurmadan da qoruyasız. Düzənliklə dağlıq uyğunlaşmır. Burada daha da diqqətli olmaq lazımdır. Qalanını da ki, bilirsiz, hərbi xidmət keçmiş döyüşçülərsiniz.

Bizim söhbətimizin bu məqamında artıq Rəşadətgilin sıraya düzülməsi üçün əmr verildi. Onlar buradan başqa cəbhəyə gedəcəkdilər. Biz bir daha bir-birimizə sarılaraq görüşüb sağollaşdıq. O bir neçə addım getdikdən sonra geri dönərək uca səslə, “Rizvan, özünü qoru” – deyərək mənə əl etdi. O vaxtdan bir neçə ay ötmüşdü. Artıq 1993-cü il idi. Daha doğrusu, 1993-cü il fevral ayının 18-də yuxarı komandanlığın əmri ilə Rəşadət hərbi xidmətini davam etdirmək üçün yenidən Laçına, bizim xidmət etdiyimiz 5-ci Bərdə taborunun II bölüyünə, yəni mənim komandirlk etdiyim bölüyə köçürülmüşdü. Bu tarixdən təxminən bir ay sonra, mart ayının sonlarında Kəlbəcər ərazisində vəziyyətin gərgin olmasını nəzərə alaraq Müdafiə Nazirliyi bizim hərbi hissənin dərhal Laçından Kəlbəcərə köçürülməsi haqqında əmr vermişdi. O əmr əsasında biz Kəlbəcərə yerdəyişmə etdik. Artıq mart ayının sonu idi. Kəlbəcərdə vəziyyət həqiqətən də çox gərgin idi. Kəlbəcərin işğal olunacağı hiss olunurdu. Bizim hərbi hissəyə həm Kəlbəcərin müdafiəsi, həm də əhalinin təxliyyə olunmasına kömək tapşırılmışdı. Bu bizim üçün çətin olsa da, yerinə yetirməyə borclu idik. Kəlbəcər–Ağdərə yolu bağlı olduğundan əhalinin yalnız az sayda olan hissəsi vertolyotlarla, qalan böyük

hissəsi isə əsasən də çox təhlükəli olan Murov yolu ilə təxliyyəsi yerinə yetirilirdi. Aprel ayının 2-si, Kəlbəcərin işğalına qədər və ondan sonrakı bir neçə gündə bizim 5-ci Bərdə taborunun on nəfər şəhid və itkini, o cümlədən onlarla yaralısı oldu. Kəlbəcərin qorunması və əhalinin təxliyyəsi üçün bütün şəxsi heyətlə bərabər taborumuzun əsgəri Rəşadət Piriyevin də ağır və şərəfli fəaliyyəti olmuşdur ki, bütün bunlar aradan uzun zaman ötməsinə baxmayaraq bütün döyüşçülərin yaddaşından silinməyib.

Mən Rəşadətin igidliyini Kəlbəcərin işğalından aylar sonra ermənilərin Murovdağda bizim mövqelərimizə güclü hücumu zamanı da görmüşdüm. Bu iyun ayının 10-u tarixində olmuşdu. Həmin gün düşmən bizim mövqeləri öncə top mərmiləri ilə atəşə tutmuş, sonra isə hücuma keçmişdilər. O zaman Bərdədən Elsevər Hüseynov, Xanlardan isə Dilqəm adlı əsgərimiz şəhid olmuşdu. Həmin döyüşdə Rəşadət Piriyevin PK silahı ilə düşmənin geri oturdulmasında, onların məhv edilməsində böyük xidməti olmuşdu. O, həqiqətən də çox mərd və cəsur döyüşçü idi.

15 avqust 1993-cü ildə bizim 5-ci Bərdə taborunu Müdafiə Nazirliyinin əmri ilə Ağdama göndərdilər. Bildiyiniz kimi bu zaman artıq Ağdam da işğal olunmuşdu. Bizim tabor Sarıcalı kəndi ərazisində müdafiədə durmuşdu. Ermənilər tez-tez mövqelərimizi mərmi atəşinə tuturdular. Növbəti mərmi atəşləri isə avqust ayının 21-də oldu ki, bu atəşlər nəticəsində Rəşadət Piriyevlə bərabər bir neçə əsgərimiz də qəlpə yarası alaraq Bərdə rayon xəstəxanasına göndərilmişdi. Rəşadət həm kürəyindən, həm də qolundan yaralı idi. Aradan bir neçə gün keçdikdən sonra isə, daha dəqiq avqust ayının 25-də səhər saatlarında yenidən bizim həmin postlarımız tank mərmiləri ilə atəşə tutuldu. Bu mər-

mi atəşində həmkəndlimiz Eldəniz Nəzərov və Sadiqi Ənvər şəhid olmuş, bölük komandiri Ramiz Cəfərov, o cümlədən bir neçə əsgərimiz də yaralanmışdı. Şəhid Eldəniz Nəzərov Yeni Daşkəndli olduğundan Rəşadət Piriyev Bərdə xəstəxanasında bir həftəlik müalicədən sonra icazə alaraq Eldənizin yas məclisində, 7 mərasimində də iştirak etmişdir. O gündən tam bir həftə sonra isə Rəşadət xəstəxanadan müəyyən müddət dincəlmək üçün evə buraxılmışdı. Dekabr ayında bizim taborun tam şəxsi heyətinin yenidən toplanması üçün göstəriş verilmişdi. Qeyd edim ki, biz Kəlbəcərdən çıxdıqdan sonra taborun bir çox əsgərləri evə getmiş, hələ də qayıtmamışdılar. İndi bu döyüşçülərin hamısının Hacıkəndə toplanması vacib idi və bunun üçün onlara məlumat göndərilirdi. Döyüşçülər Hacıkəndə az-az toplaşırdılar. Briqadadan da tapşırıq vardı ki, döyüş qabiliyyəti olan hamı yığılmalı, hər kəs öz yerində olmalıdır. Onda məni də bölük komandiri olaraq Bərdəyə göndərdilər ki, o ərazidə olan döyüşçülərin hərbi hissəyə qayıdışını təşkil edim. Mən döyüşçülərlə bir-bir görüşüb hərbi hissəyə qayıdışla bağlı söhbət etdiyim məqamda, Rəşadət də qayıdacağını bildirdi. O zaman mən ona etiraz edib dedim ki, sən yaralısan, yaran da tam sağalmayıb, hələlik qal müalicəni tam al, sağal, qurtarandan sonra xidmətə gələrsən. O isə dedi ki, yaram məni incitmir, artıq özümü sağlam hiss edirəm, həm də artıq döyüşçü yoldaşlarım üçün də darıxıram, hiss edirəm ki, onlardan ayrı qala bilmirəm. Beləliklə, bir həftə içində bütün döyüşçülərlə bərabər Rəşadət də Hacıkəndə gəldi. Onun tam sağalmamış Hacıkəndə, xidmətə gəlişini hamı təəccüblə eyni zamanda alqışla qarşıladı. Hərbi hissənin həkimi Cəlal həkim isə Rəşadətin vaxtından tez qayıdışına ciddi şəkildə etirazını bidirdi. Lakin Rəşadəti

fikrindən döndərə bilməyəcəyinə əmin olduqdan sonra onu yenidən müayinə etdi və dedi ki, eybi yoxdu, qal hərbi hissədə, ancaq müəyyən müddət yaranla bağlı ehtiyatlı olmalısan. Rəşadət isə Cəlal həkimə narahat olmamasını, özünü sağlam hiss etdiyini bildirdi. Və onu da dedi ki, mənim yoldaşlarım hardadısa, mən də orada olacağam.

1993-cü ilin sonları idi. O vaxt bizim taborda rabitə tağımı yaratdılar. Elə oldu ki, Rəşadət də rabitə üzrə kursa getdi. Onunla bərabər kursa gedənlər arasında digər döyüşçü Xanlarov İlham da var idi. Komandirləri də Bakıdan Zakir adlı biri idi. Rəşadət və Xanlar rabitə kursunda bir müddət olduqdan sonra hərbi hissəyə rabitəçi olaraq qayıtdılar. İkinci Kəlbəcər əməliyyatı başlayanda Xanlarov İlhamı rabitəçi kimi verdilər bizim bölüyə, Rəşadət Piriyevi isə kiçik leytenant Rövşən Məcidovun komandiri olduğu birinci bölüyə təyin etdilər. Dekabr ayının sonunda biz yuxarı komandanlığın əmri ilə ikinci Kəlbəcər əməliyyatına başladıq. Bu o zaman həm relyefə görə, həm hava şəraitinə görə uyğunsuz döyüş planı idi. Ancaq bütün çətinliklərə baxmayaraq döyüşçülər qəhrəmancasına döyüşürdü ki, bu qəhrəmanlıqda Rəşadətin də rabitəçi payı var idi. 1994-cü il yanvarın 18-də mən bu əməliyyatda yaralandım. Ondan sonrakı döyüşlər haqqında məlumatım olmadı.

Bizim qədirbilən xalqımız heç vaxt şəhidləri və itkinləri unutmur. Onları xatırlayır, yada salır, ruhlarına uca Tanrıdan rəhmət diləyirlər.

*Yeni Daşkənd, 13.08.2023*

**Yusif İsmayılov**
*Qarabağ müharibəsi iştirakçısı*

## ÇADIR OD TUTUB YANIRDI

1994-cü il fevral ayının 11-də Qızlqaya Buzluq istiqamətində olan tərəfdə gizli mövqedə qurulan çadırı düşmən vurmuşdu. Çadır od tutub yanırdı. Həmin mövqedə Alaçadırlı Ələddin, Lənbəranlı İsa, Yeni Daşkəndli Rəşadət və başqaları olmaqla cəmi 15 əsgər idilər, bir də İranlı Baba orada olub. Onlar qışqırırdılar ki, bizə kömək eləyin. Biz isə hardasa 25 nəfər olardıq. Hava da çox dumanlı idi. Dərəyə tərəf tökülürdük ki, onlara bir yolla, necəsə kömək edək. Bu vaxt biz də erməni əsgərləri ilə qarşılaşdıq. Kərəm qışqırdı ki, Yusif Qılman vuruldu. Rəhmətlik Qılman həmin gün şəhid oldu. İndi onu itkin hesab edirlər, amma yanımızda şəhid oldu. Onu çıxara bilmədik, cəsədi orada qaldı. Biz məcbur olub geri çəkildik.

Bizə fevralın 15-i məlumat verdilər ki, artıq Murovdan o tərəfə, yəni, Yanşaq tərəfdə, Qızılqayada heç kim yoxdur. Bəs siz hardasınız? Mən dedim ki, Qızılqayadan Bağırlı, Bağırsaq dağına tərəf ermənin dağıtdığımız mövqeyi tərəfdəyik. Neçə nəfər olduğumuzu soruşdular. Rabitədə özüm idim, cavab verdim və onunla da rabitəni bağladıq. Biz ayın 16-sı yol getməyə başladıq. Ayın 17-si səhər-səhər çox çətinliklə, bir təhər Koroğlu dağının başına qalxdıq. Hətta orada biz Koroğlu dağının ətəyi ilə hərəkət edən zaman ermənilər arxamızca işıq verən mərmilər, fişənglər atırdılar. Mən bir az arxaya qaldım ki, birdən arxamızca gələr, bizə hücum edərlər. Dedim bəlkə mən onları bir az

karıxdıraram, əsgərlər sağ-salamat irəliləyər, mən də sonra tək çıxa bilərəm.

Ən axırıncı biz oradan çıxmışıq, ayın da 17-si idi. O da yadımdadı ki, biz oradan tökülüb gələndə Kərəm qarın tarına düşdü, qollarını açıb dayandı. Mənə dedi ki, Yusif yaxına gəlmə, ayağım yerə dəymir. PK-nın qayışını açıb ona atdım, o da tutdu. Dartıb onu çıxartdım. Hamımız aşağı gəldik. Biz aşağıda Nəcməddin Sadıkovu, Elxan Orucovu, Əvəz Şükürovu gördük.

Biz Xanlarda olanda İsanın, Ələddinin, Rəşadətin qohumları gəlmişdilər ora. Onlara mən necə görmüşdüm, necə bilirdim eləcə də hər şeyi olduğu kimi danışdım. Onu da dedim ki, axtarmağın mənası yoxdu. Ancaq Beynəlxalq Qızıl Xaç və Qızıl Aypara Cəmiyyəti ilə əlaqə saxlamaq lazımdı. Onda bilinər ki, onlardan əsir düşəni olub, yoxsa şəhid olublar.

Allah şəhidlərə rəhmət eləsin.

*01.09.2023*

**Şahsuvar Əliyev**
*Qarabağ müharibəsində rabitəçi*

## YADİGAR BIÇAQ

Rəşadətlə Yanşaq kəndində bir yerdə rabitədə olduq. Taborda rabitə bölüyü vardı. Rabitə komandiri də Göyçaylı Zakir idi. Yəni, onun bölüyündəydik. Axırıncı dəfə elə Rəşadətlə orada, Yanşaqda bir yerdə idik. Əsgərlərin hamısı yuxarıda mövqedə idi, aşağıda qalan Rəşadətlə mən idim. Sonra elə oldu ki, orada bir İranlı vardı, adına Baba deyirdilər. Onun olduğu mövqeyə rabitəçi lazım oldu. Rəşadət ora gedəsi oldu. Axşamtərəfiydi, saat 4–5 olardı. Rəşadət həmin mövqeyə getdi. Rəşadətin rabitə qurğusuna bir dənə də əlavə batareya verdim. Getməmişdən də bir saat qabaq mənə sapı ağ rəngdə olan bir bıçaq verdi. Bu günkü kimi yadımdadı. Həmin bıçağı mənə verəndə dedi ki, mövqeyə gedirəm, ölüm bir anlıqdı. Əgər başıma bir iş gəlsə bıçağı məndən özünə yadigar kimi saxlayarsan. Gedəndən sonra gecə saat 1-ə kimi Rəşadətlə mənim əlaqəm oldu. Mən onla tez-tez əlaqə saxlayırdım. Arada deyirdim ki, a kirvə, a kirvə. O, da deyirdi ki, ə paralonu de, parolunu de. Belə bir zarafat da edirdik.

Hə, elə oldu ki, gecə saat 1-dən sonra Rəşadətgillə əlaqə kəsildi. Mən ora-bura məlumat verdim ki, bəs filan mövqedən rabitəyə cavab verən yoxdu. O vaxt da səhv etmirəmsə həmin mövqeni “Çinar” deyib çağırırdıq. Nə qədər çağırdıq, bəlkə də 15–20 dəfə elə mən özüm çağırdım, gördüm cavab gəlmədi. Həmin gecədən sonra onlarla əlaqəmiz kəsildi. Bilmədim necə oldu. Onun sabahı, ya da bir neçə gün sonra idi. Əfqanıstanda döyüşən uşaqlardan gətirmiş-

dilər. Onlar bizdən yuxarıdaydılar. Onlar gələndən 4–5 gün sonra dağıldıq. Ermənilər hücuma keçdi. Biz oranı məcburən tərk elədik. O qədər də tələsik çıxdıq ki, Rəşadətin yadigar verdiyi bıçağı götürə bilmədim. Heç üstümdəki rabitə qurğusunu da apara bilmədim. Onu çaya atdım. Rəşadətin mənə bağışladığı bıçağa görə çox heyifslənirəm ki, onu götürə bilmədim.

Az müddətdə də olsa Rəşadətlə bir yerdə olduq, bir boşqabda yemək yedik. Gözəl döyüşçü olub. Dərdimizi birbirimizlə bölüşürdük.

Allah ona və bütün şəhidlərimizə rəhmət eləsin. Məkanları cənnət olsun.

*01.09.2023*

**Camal Canbaxışov**
*II qrup Qarabağ müharibəsi əlili*

## RƏŞADƏT CƏSUR DÖYÜŞÇÜ İDİ

Rəşadətgillə kirvə olmuşuq. Ona görə də uşaqlığımız bir yerdə keçib. Rəşadətin özündən böyük qardaşı Rəşidlə mən Ağcakəndin və Ağdərənin, eləcə də Naxçıvanikin (Naxçıvanlı) düşmənlərdən təmizlənməsində iştirak etmişik. Ağcakənd azad olunanda ora ilk girən tankın üstündə Rəşid olmuşdu. Bunu onun döyüşçü yoldaşları bu gün də fəxrlə danışırlar. Rəşadətlə isə mən 1992-ci ildən Laçında birlikdə xidmət keçmişik. Rəşadət çox ürəkli, mərd, heç nədən çəkinməyən bir döyüşçü olub. Həqiqi vətənpərvər, dövlətini, xalqını sevən bir oğul idi. Həmişə deyərdi ki, mən gərək elə qəhrəmanlıq göstərəm ki, Rəşid özü də mənlə fəxr eləsin.

1993-cü ildə Kəlbəcər işğal olan ərəflər idi. Bizi Laçından Kəlbəcərə gətirdilər. Keçiliqaya, Ağdaban istiqamətinə qaldırdılar. Oradakı döyüşlərdə Rəşadət hücuma keçən erməni əsgərlərindən bir neçəsini hamımızın gözü qabağında gülləylə yerə sərdi. Çox döyüşkən idi, qətiyyən döyüşdən qorxan deyildi. Ancaq hücuma can atırdı.

1993-cü ilin avqust ayında ermənilər Ağdamda güclü hücuma keçdilər. Onda da yaralanana qədər düşmənin qabağından geri çəkilmədi. Əlimizdə olan mövqelərdən çıxmadıq. Rəşadət belə bir cəsur döyüşçü idi. Bir yerdə idik. Rəşadətlə Etibar yaralandı. Rəşadəti Bərdə xəstəxanasına yerləşdirdilər. Xəstəxanadan çıxandan sonra nə qədər elədik ki, daha yaralanıbsan, xidmətə qayıtma. Dedi ki, yox, mümkün deyil. Mən axıra kimi xidmət edəcəm, düşmənlə

vuruşacam. Həmin günlərdə Nəzərov Eldəniz şəhid olmuşdu. Deyirdi ki, gərək mən Eldənizin qanını alam. Elə də elədi. Ambulator müalicəsi bitməmiş Hacıkəndə hərbi hissəyə getdi. Oradan da İkinci Kəlbəcər əməliyyatı döyüşlərinə qoşuldu. 1994-cü ildə elə İkinci Kəlbəcər əməliyyatında da döyüş zamanı itkin düşdü.

Allah bütün şəhidlərimizə rəhmət eləsin.

*13.08.2023*

**Murad Orucov**
*Qarabağ müharibəsi iştirakçısı,*
*Rəşadət Piriyevin sinif yoldaşı*

## İDMANÇILARA XAS GÖRKƏMİ VARDI

Rəşadət həqiqətən vətənpərvər oğlan idi. Yaxşı, etibarlı yoldaşıydı. Onunla olan xatirələrim çoxdu. Sinifimizdəki uşaqlardan deyərdim ki, ən çox mənlə yoldaşlığı olub. Biz orta məktəbi qurtaranda Rəşadət hərbi məktəbə getmək istəyirdi. Onun fikri vardı ki, ya hərbçi, ya da polis işçisi olsun. Niyə getmədi bilmirəm, o yadımda qalmayıb. Aqil Əliyev, Ziya Quliyev və mən o vaxt hərbi məktəbə sənəd verdik. Muxtarın oğlu Mübariz Əliyev bizi Bakıya gətirdi. İlkin imtahanları verdik. Sonra bizi Özbəkistana əsas imtahanları verməyə çağırmalıydılar. Bizə gec məlumat verildiyindən çatdırıb gedə bilmədik.

Rəşadətlə orta məktəbdə oxuyandan bir yerdə çox günlərimiz olub. İdarənin qabağında pambıq tökülən “naves”lərin yanında kağız kisələrdə yonca toxumu vardı. Çoxdan qaldığından daş kimi bərkiyibmiş. Amma mən bu kisələrin bərk olduğunu bilmirdim. Klubla “naves”in arasındakı keçiddə dayanmışdıq. Rəşadət mənə dedi ki, Murad, gəl qaça-qaça gedib sürətlə kisələrə təpik vuraq. Görək kimin zərbəsi bərk dəyir. Dayandığımız yerdən ora da xeyli məsafə olardı. Sürətlə qaçmağa başladıq və mən ondan qabaq çatan kimi təpiklə yonca toxumunun kisəsinə bərk zərbə vurdum. Heç inanın ki, kisə yerindən tərpənmədi. Zərbənin təsirindən yuxarı qalxıb dizüstə yerə düşdüm. Asfalt şalvarımı cırdı. Özü də çox da uşaq da deyildik. Yəqin ki, 8-ci sinifdə oxuyardıq. Geri çönüb gördüm ki, Rə-

şadət elə gülür, elə gülür nətəri... Mən də yerdə ağrıdan qıvrılırdım. Özümə gələndən sonra dedim, ə, bə sən niyə təpik vurmadın? Bilirdin eləmi bu kisələrin daşlaşdığını? Rəşadət dedi ki, Murad məni də belə aldatmışdılar. Ayağımı səni kimi mən də əzmişdim. Dedim bir sənlə zarafat edim.

Şahvələd Kamaz sürürdü. Biz ona Kalxeda deyirdik. Onu götürüb Rəadətlə Ağ evə, Köhnə qəbiristanlığa tərəf gedirdik. İki gündən, üç gündən bir gedib ot biçib kalxedaya yığıb mal-heyvana gətirirdik. Belə günlərimiz də çox olub.

1991-ci il idi. Bibim oğlu Məzahir Kərimovun yanında PMK-45-də işləyirdim. Xankəndidən və Əsgərandan çıxarılmış ilk Azərbaycanlı qaçqınlar üçün Ağdamın Əliağalı kəndi ilə Ağdərənin Sırxavənd kəndi arasında qəsəbə, şəhərcik salırdıq. Böyük tikinti işləri gedirdi. Mən də gedib orada Məzahirin yanında işləyirdim. Məzahir orada mühəndis idi. Bir neçə günüydü işləyirdim. Rəşadət mənə dedi ki, Murad, Məzahirə de mən də gəlim orada işləyim. Mən də Məzahirə dedim, o da sağ olsun, dedi ki, gəlib işləsin. Düz əsgərliyə gedənə qədər, bir ilə yaxın orada işlədik. Yəni, 1991-1992-ci illərdə bir yerdə həmin tikinti idarəsində işləmişik. Hətta orada o işləyə-işləyə peşə məktəbini də bitirib sürücülük vəsiqəsi aldı. Hər gün bir yerdə olurduq. Rəşadət idmanla məşğul olduğundan sağlam bədəni, idmançılara xas görkəmi vardı. Bədənli uşaq idi.

Rəşadət çox qoçaq, zəhmətkeş oğlan idi. O adicə yeriyəndə belə yumruğu sıxılı gedirdi. Qolları, biləyi dəmir kimiydi. Tikintidə işləyən vaxt vaqonla sement gəlirdi. Mənə deyirdi ki, gedək sementi boşaldaq zəhmət haqqı alaq, əlavə pul qazanaq. Məsələn, yaşlı adamlar dörd nəfərə bir va-

qonu boşaldırdı. O mənə deyirdi ki, biz ikimiz bir vaqon boşaldaq. Şifer gəlirdi o da onu kimi, gedib iki nəfərə boşaldardıq. Yaxşı zəhmət haqqı alar, aramızda bölərdik. Qarabağda işləyənlərə çox maaş verildiyindən biz həm də yaxşı məvacib alırdıq.

1992-ci ildə əsgərliyə getdik. Rəşadət Şıxovdakı "N" saylı hərbi hissəyə düşmüşdü. Oradan da birbaşa Qarabağ müharibəsində döyüşlərə getdi. Sonralar da Bərdə taboruna köçürüldü. Və Kəlbəcərdə şəhid oldu... Onu heç vaxt unuda bilmərəm.

Allah şəhidlərimizə rəhmət eləsin.

*Bakı, 03.09.2023*

Rəşadət Piriyevin anası Sədət Piriyeva və atası Əli Piriyev

Rəşadət Piriyevin babası Əbil Piriyevin Göyçə mahalından deportasiya olunması haqqında sənəd. 16.05.1953



Rəşadət Piriyevin
uşaqlıq illəri



Rəşadət Piriyev
məzun olarkən



Rəşadət Piriyev
hərbi xidmətdə



Rəşadət Piriyevin
yeniyetməlik illəri



Rəşadət Piriyev müəllimi və sinif yoldaşları ilə







Rəşadət Piriyevin müəllimləri və sinif yoldaşları
Yeni Daşkənd kənd orta məktəbi, 1990-cı il



Rəşadət Piriyev sinif yoldaşları ilə





Rəşadət Piriyev sinif yoldaşları ilə



Rəşadət Piriyev müəllimləri və sinif yoldaşları ilə



Rəşadət döyüşçü yoldaşları ilə. İstisu, Kəlbəcər, 16.05.1992





Rəşadət Qarabağ müharibəsində döyüşçü yoldaşları ilə



Rəşadət Piriyev Qarabağ müharibəsi zamanı xidmət etdiyi
5-ci Bərdə taborunun döyüşçüləri ilə



Rəşadət Qarabağ müharibəsində döyüşçü yoldaşları ilə



Rəşadət Piriyev ABŞ-dən gələn Məhərrəm Musayevin
Yeni Daşkənd kəndində qarşılanması zamanı şənlikdə.
6 sentyabr 1993-cü il






Rəşadətin anası Sədət Piriyevanın və atası Əli Piriyevin Yeni Daşkənd kənd qəbiristanlığında məzarı





Yeni Daşkənd sakinləri və şəhid anaları
“Şəhidlər abidəsi”ni ziyarət edirlər.



EL TV Rəşadət Piriyevin həyatı və döyüş yolu haqqında
sənədli film çəkərkən “Şəhidlər abidəsi” ziyarət olunur.
Yeni Daşkənd, 20 noyabr 2017-ci il




Rəşadətin baralyefi vurulmuş “Vətən şəhidləri abidəsi”




“Vətən şəhidləri abidəsi”ndə Rəşadətin baralyefi




Rəşadətin fotosu validеynlərinin məzarında

Арајыш

Верилир həкта Пирийев Рəшадəт Əмир оғлуна ондан öтəри ки, о, həгигəтəн 21/VIII-93-чү ил тарихдəн 22/IX-93-чу ил тарихə кими Бəрдə мрх-нын травматолоҝија шöбəсиндə гонағы кəллə-бејин травмасы, бејин силкəлəнмəси, алында, сол күрəкдə гəлпə јарасы, јад ҹисим диагнозу илə мүаличəдə олмушдур. Арајыш верилир ҺО-нун həрби hиссəјə тəгдим етмəк үчүн.

Һəким: [signature] /Ғəнбəрова/.

22/IX-93

Rəşadət Piriyevin yaralanması haqqında verilən arayış, Ağdam cəbhəsində yaralanma tarixi: 21 avqust 1993-cü il.

21.08.1993.

Позисијада [illegible] сонра Пиријев Рәшадәт, Чәфәров Әлибәј јараланмышлар. Рәшадәти Бәрдә хәстәханасына, Әлибәји исә Бакыја, һәрби госпитала көндәрдиләр.

---

* *Süleyman OSMANOĞLU*

## Јаншаға гәфил думан кәлди...

- Иран-Ираг мүһарибәсиндә иштирак етмишәм. Боснијада мүсәлманларла чијин-чијинә дөјүшмүшәм. Бокс үзрә идман устасыјам, гызыл медал алмышам. Забитәм. Атам автомобил гәзасында һәлак олуб. Үч бағорујуб сахламаг мәним ротама һәвалә едилди. Ајын 10-на гәдәр 16 нәфәр орада галдыг. Һәмин күн мәни дөјүшмәјә кәлмәли идиләр. Чүнки бөјрәкләримдә сојуглама варды. Күнортадан сонра Јаншағы гәфил думан бүрүдү. Ики-үч метр мүсафәни сечмәк мүмкүн дејилди. Бирдән лап јахын мәсафәдән ерменилярин сәсини ешитдик. Дүшмәнчаг бир-ики кәлмә деjә билди: "Ах, ана, өлдүм!" Дүшмәнләр һәр тәрәфдән үстүмүзү алырдылар. Әләддин адлы оғлан варды, Бәрдәдән. Мәни дөјүшмәјә кәлмишди. "Өләрәм, анҹаг дүшмәнә әсир дүшмәрәм", - деди. Сонра әлиндәки гумбара илә өзүнү партлатды, гәлпәләр мәнә дә дәјди. Иса, Меһди дә һәлак олдулар. Биздән ҹәми 200-

---

### МУРОВДА ШӘҺИД ОЛДУ



Пиријев Рәшадәт Әли оғлу 1973-чү илдә Бәрдә рајонунун Јени Дашкәнд кәндиндә анадан олмушдур. Тале елә кәтирмишдир ки, онун валидејнләри бир нечә ил әввәл Азәрбајчана Көјчә маһалындан — Басаркечәрин Дашкәнд кәндиндән көчүб кәлмишләр. Анчаг өз арзулары илә јох, зорла, һијлә илә ермәни дашнакларынын хәјанәти сајәсиндә.

Рәшадәт Көјчәли олмасы илә һәмишә фәхр едәрди. Сөз-сөһбәт вурғуну иди. Шаир Алгајытын, Шүрујјәнин ше'рләрини динләмәкдән илһам алар, ашыг Һачы вә ашыг Нурәддинин телли сазлары көјнәкдән чыхыб "Мисри", "Орта Сарытел", "Кәрәми", "Чәлили" үстүндә көкләнәндә үрәјинә дағ бојда фәрәһ һисси доларды. Рәшадәт 1991-чи илдә орта мәктби мүвәффәг гијмәтләрлә баша чатдырды. Сон имтаһандан сонра он ил биркә отуруб-дурдуғу мәктәбли достлары илә чај сүфрәси тәшкил етдиләр. Нөвбә илә һәрә өз үрәк сөзләрини деди, кәләчәк арзуларындан данышды. Рәшадәт исә бир-ики кәлмә демәклә сөзүнү белә јекунлашдырды:

— Ушаглар, нә гәдәр чалышырамса хош бир ифадә ишләтмәјә чәтинлик чәкирәм. Чүнки, јурдумуза хаин әлләр узаныб, ермәниләр гудуз итә дөнмүшләр. Артыг әлимиз түфәнк тутур, биз дә сөзүмүзү демәлијик...

1991-чи илин мај ајында Рәшадәт әскәри хидмәтә јолланды. Әјнинә әскәр палтары кејинди. Чох кечмәдән онун сәдасы одлу нөгтәләрдән кәлди. Ағдәрә бөлкәсиндә кедән дөјүшләрдә гејрәт вә чәсарәт көстәрди. Кәлбәчәр торпағынын дүшмәнләрдән горунмасында онун бөјүк хидмәтләри олду. Маһир топчу кими ад-сан газанды. Дәфәләрлә өлүмлә үзләшди. Лакин һеч нәдән горхмады, ән чәтин анларда дашнаклара ағыр зәрбәләр ендирди. Онлары леш-лешә сөјкәди.

1993-чү ил августун 22-дә ахшам саат 6 радәләриндә дүшмәнләр Муровдағ истигамәтиндә зиреһли техниканын күчү илә һүчума кечдиләр. Һәмин ағыр дөјүшдә Рәшадәт бәдәниндән ағыр күллә јарасы алды вә һәрби хәстәханаја дүшдү. Һәр дәгигә, һәр ан онун гәлби сәнкәрләрдә, дөјүшчү јолдашларынын јанында иди. Елә буна көрә дә мүаличәси там баша чатмамыш јенидән чәбһәјә јолланды.

1994-чү ил февралын 5-и Рәшадәтин сон дөјүшү олду. Дөјүш әмәлијјаты тапшырығыны јеринә јетирәркән Муровдағ бөлкәсиндә Р. Пиријевин синәси дүшмән күлләсинә туш кәлди вә ганы Вәтән торпағына гарышды. Хош арзулары јарымчыг галды Рәшадәтин, дүнјадан азадлыг ашиги кими көчдү...

Rəşadət Piriyev haqqında gündəlik, qəzet və kitab



Şəhid
Rəşadət Piriyevin adını
yaşadan qardaşı nəvəsi
Əbilov Rəşadət Elçin oğlu



Şəhid
Rəşadət Piriyevin adını
yaşadan dayısı nəvəsi
Məmmədli Rəşadət
Ələsgər oğlu



Yeni Daşkəndli şəhid anaları
(şəkildə soldan 1-ci Rəşadətin anası Sədət Piriyeva)




“Karabağ şehidi Ali oğlu Reşadet Piriyev su kuyusu”
Kamerun, Afrika, 2020-ci il




Rəşadətin qardaşları Şahsuvar, Şahmurad və Şahvələd
"Vətən şəhidləri abidəsi"ni ziyarət edərkən.
Yeni Daşkənd, 13 avqust 2023-cü il




Rəşadətin qardaşları Şahmurad, Şahvələd və Şahsuvar
“Vətən şəhidləri abidəsi”ni ziyarət edərkən.
Yeni Daşkənd, 13 avqust 2023-cü il



Rəşadətin qardaşı
Rəşid Piriyev
Birinci Qarabağ
müharibəsində







Rəşid Piriyev Qarabağ müharibəsi zamanı döyüşçülərlə





Rəşid Piriyev Qarabağ müharibəsi zamanı döyüşçülərlə




Rəşadət Piriyevin qardaşları:
Şahmurad, Rəşid, Şahvələd və Şahsuvar



Rəşid, Şahsuvar, Şahvələd və Şahmurad Piriyevlər



Rəşadətin qardaşı Şahmurad və onun doğmaları





Rəşadətin qardaşı Şahvələd və onun doğmaları





Rəşadətin qardaşı Şahvələd, anası Sədət və doğmaları
toy şənliyində






Rəşadətin doğmaları toy şənliyində



Rəşadətin qardaşı Şahsuvar və onun doğmaları






Şəhid Rəşadət Piriyevin qardaşı Rəşid Piriyev
və onun ailəsi

## Pirilər nəslinin şəhidlik şəcərəsi



**Elmir Şıxəliyev**
*II qrup Qarabağ müharibəsi əlili,*
*Rəşadət Piriyevin sinif yoldaşı*

## ÖTƏNLƏRDƏN, KEÇƏNLƏRDƏN

Rəşadətlə həm yaxın qohumuq, həm də on il bir sinifdə oxumuşuq. Uşaqlığımız bir yerdə keçib. Uzun zaman keçsə də yadımda qalan bir neçə xatirə danışmaq istəyirəm.

Təzə-təzə məşq eləyirdik. Yeddinci sinifdə oxuyurduq. Rəşadətgilin qapısında su kranın yanında, əncir ağacından asılmış boks oynamaq üçün bir "qruşa" vardı. Mənə dedi ki, Elmir "qruşa"nın içinə parça doldurmuşam, çox yumşaqdı. Bərk bir zərbə vur, qolunun gücünə baxaq. Sən demə Rəşadət "qruşa"nın içinə kolxozun əkdiyi şəkər çuğundurunu doldurubmuş. O da daş kimi olurdu. Mən zərbəni "qruşa"ya vuran kimi əlimin üstü partladı. Bu vaxt gülə-gülə başladı qaçmağa. Dedi görürsən adamı necə aldadırlar, əlini necə partladırlar. Eləcə deyirdin ki, əlim belə bərkdi, elə bərkdi. Əlin görürsənmi necə əzildi.

Rəşadətə biz tay-tuşlarımız çox vaxt Mürşüd deyərdik. Çox mehriban, səmimi, qayğıkeş uşaq idi. Əla futbol oynamağı vardı. Dava-dalaşla arası olan deyildi. Heç vaxt istəməzdi ki, kiminsə xətrinə dəysin, kiməsə pis söz desin, kimdənsə küssün, qəti belə xasiyyətləri yox idi. Deyən-gülən, xoşxasiyyət bir yoldaş idi. Ötənlərdən, keçənlərdən yadımda qalan gülməli bir əhvalat da belə olmuşdu.

İsmayılov Naib kənddə uşaqlara karate dərsləri keçirdi. Çəkilliyin yanındakı "Ağ ev"də idik. Məniydim, Muradıydı, İqbalıydı, Şəmsiydi, Rəşadət idi, Etibar idi və başqa uşaqlar birlikdə məşq eləyirdik. Yaxşı da öyrənirdik. Kata-

nın adları vardı: Nidan, Şodan, Şotakan və sair. Naib dedi ki, Rəşadət, çıx meydana görək. Öyrətdiklərimdən nə göstərə bilirsən, yadında nə qalıb? Rəşadət çıxdı ortaya və qayıtdı ki, müəllim, Şodannıyım? Bunu demişdi ki, Naibdən bir gülmək çıxdı ki, gəl görəsən. Biz də hamımız gülüşdük. Naib dedi ki, ay Rəşadət, Şodannıyım nədi? Heç olmasa denən, müəllim, Şodan katasını göstərimmi? Hə, Rəşadət bax belə məzəli, deyib-gülən uşaq idi.

1993-cü il idi. Rəşadətlə Qəhrəmanov Əlixangilin evinin yanında qabaqlaşdıq. Biz başqa-başqa cəbhələrdə döyüşdüyümüzdən az-az görüşürdük. Gördüm qolu-başı sarıqlıdı, dedi ki, Elmir, avqustun 21-də qəlpədən yaralanmışam. Mən dedim ki, yaran tam qurtarmayınca evdə ol, xidmətə qayıtma. Dedi ki, nə danışırsan, 1–2 günə gedirəm, qala bilmərəm. Rəşadət cəbhədəki döyüşlərdən, keçirdikləri əməliyyatlardan bir az söhbət elədi. Çox həvəsli, ruh yüksəkliyi ilə danışırdı. Bəlkə də onun qədər vətənpərvər az-az olardı.

Rəşadətdən danışmaqla qurtarmaz. Sağdısa Allah qapısını açsın. Mehdinin də, Ziyanın da, onun da. Qurban demişəm, hansı gəlsə, fərqi yoxdu, ayaqlarının altında qurban kəsəcəm. Allaha qurban olum, onun möcüzələrinə inanan adamam. Mən ümidimi üzməmişəm. 1941–1945-ci il müharibəsinə Göyçədən gedən Musayev Məhərrəm düz 52 il sonra Yeni Daşkəndə gəldi. Ola bilər ki, bunlar da gələrlər. Allaha qurban olum. Allah bizə o möcüzəni gösətərə bilər.

*Yeni Daşkənd, 10.08.2023*

**Şahmurad Piriyev**
*Rəşadət Piriyevin qardaşı*

## SON GÖRÜŞ

Mən ailəmizin böyük, Rəşadət isə kiçik övladıdır. Təxminən 20 yaş fərqimiz var. Ona görə də həmişə onu çox istəyirdim. O da mənim çox hörmətimi saxlayırdı. Nə desəm baş üstə deyərdi. Rəşadət orta məktəbi qurtaran ərəfələrdə Qarabağda yavaş-yavaş hadisələr qızışırdı. Bir-iki ildə keçmişdi ki, müharibə gedirdi. Özünümüdafiə batalyonları yaranırdı. Rəşadətdən böyük olan qardaşım Rəşid özünümüdafiə batalyonunda döyüşürdü. Onun döyüşlərdə iştirakından Rəşadət də həvəslənirdi. Bir gün vətənpərvərliyindən idi ki, dedi, mən də döyüşə getmək istəyirəm. 1992-ci ildə komissarlıq vasitəsilə həqiqi hərbi xidmətə getdi. Əvvəlcə 701 saylı hərbi hissədə, sonra isə Gəray Əsədovun batalyonunda xidmət elədi. O vaxt kəndimizin gənclərinin də demək olar ki, hamısı orada qulluq edirdilər.

1993-cü ilin yayında Ağdamda yaralanmışdı. Yarası hələ tam qurtarmamış dedi ki, uşaqlar Kəlbəcər uğrunda döyüşə gedirlər, qalası deyiləm, mən də gedirəm. O gedəndən bir neçə gün sonra yanına getdim. Müəllimlər evi, həm də qəsəbə 101 deyirdilər, orada görüşdük. Mənə dedi ki, niyə gəlibsən. Biz Kəlbəcərə gedirik. Onunla son görüşüm bax onda oldu. Qardaşım Rəşadətin xatirələri bax beləcə yaddaşımda qaldı. Sonra o bir neçə yoldaşları ilə bərabər Kəlbəcər döyüşlərində itkin düşdü. O vaxtdan gözlərimiz yollardadır. Ona qurban demişəm. Qardaşım sağ-salamat kəndə gəlsin, qurban kəsəcəm.

Sağdısa Allah qapısını açsın, şəhid olubsa Allah cənnətməkan eləsin. Daha nə deyə bilərəm. Bütün şəhid doğmaları kimi mən də qardaşımla qürur duyuram. Rəşadət kimi oğulun qardaşı olmaq qürurverici bir hissdir.

*Yeni Daşkənd, 29.08.2023*

**Tərcüman Məhərrəmova**
*Rəşadət Piriyevin bacısı*

## MƏN BACISI ÖLƏYDİ

Qardaşım Rəşadət çox yaxşı uşağıydı. Elə mehriban, elə gülərüz, elə zəhmətkeş idi ki, gəl görəsən. Qapıda, məhlədə hər işə yetik idi. Mal-heyvanımıza baxardı. Atama, anama kömək olardı. Ermənin evi yıxılsın. Elə ki, bizlə müharibəyə başladılar, əvvəl qardaşım Rəşid döyüşə getdi. Sonra da Rəşadət getdi. Rəşadət bir dəfə ağır yaralandı, yenə də qalmadı. Kəlbəcərdə çox döyüşlərdə oldular. Rəşadətgil qarda-boranda döyüşürdülər. Soruşanda eləcə deyərdi ki, narahat olmayın, hər şey yaxşıdı. Elə bəd xəbəri də Kəlbəcərdən gəldi. Gah dedilər əsir götürüblər, gah dedilər elə oradaca şəhid olublar. Belə nagüman qalmışıq. O gələndə qabağına dizin-dizin sürünəcəm. Mən bacısı öləydi, onsuz yaşamayaydım.

Canım qardaşım Rəşadətin xəbəri çıxandan sonra hamımız sarsıldıq. Onun həsrətiylə anam bu dünyadan köç etdi. Anamın gözləri hər yerdə onu axtardı. Eləcə deyirdi balam bir gün gələcək. Bir də baxırdın öz-özünə bayatı deyir:

Analar yanar ağlar,
Günləri sanar ağlar.
Dönər göy göyərçinə,
Yollara qonar ağlar.

Ağacda xəzəl ağlar,
Dibində gözəl ağlar.
Oğlu ölən analar,
Sərgərdan gəzər, ağlar.

Allah heç bir ataya, anaya, bacıya qardaş acısı yaşatmasın. Uşaqlarımız, nəvələrimiz belə dayıları olduğuna görə onunla fəxr edirlər.

Allah bütün şəhidlərimizə rəhmət eləsin.

*31.08.2023*

**Mehriban Kərimova**
*Rəşadət Piriyevin bacısı*

## AİLƏMİZİN BİR BUDAĞI

Biz balaca olanda atamız, anamız yaxşı tərbiyə verər, mərd, mədəni, səmimi olmağımızı tapşırardılar. Onların sözündən çıxmaz, nəyi nə cür desələr elə də edərdik. Kənd həyatı yaşadığımızdan hamımız zəhmətkeş idik. Rəşadət ailəmizin sonbeşiyi olduğundan biz qardaş-bacılar ərklə onu daha çox buyurub-çağırardıq. O, da qoçaq olduğundan hər işin öhdəsindən gələrdi. Mal nobatına gedər, çöl işinə qaçar, ata-anamın hər işdə əlindən tutardı. Məktəbdən də heç vaxt qalmazdı. Bütün dərslərə gedər, özünə görə orta-bab oxuyardı. Məktəbi qurtarandan bir qədər sonra əsgərliyə getdi. O çağırılanda müharibə gedirdi. Onu da döyüşlərə apardılar. Həmişə də komandirlərinin ondan razılıq etdiyini eşidirdik. Müharibədə Rəşadətdən böyük olan qardaşım Rəşid də iştirak edirdi. Ailədə beş qardaş, iki bacı böyük bir qollu-budaqlı ağac kimi idik. Rəşadət Kəlbəcərdə gedən müharibədə itkin düşəndən sonra ailəmizin bir budağı sındı. Biz iki bacı anamızla bərabər elə hey qulağı səsdə olduq. Hər il ümid etdik ki, yəqin Rəşadəti əsir götürüblər, bu il azad olunar, qayıdar gələr. Nə vaxt eşitsəm ki, o gəlir ayaqyalın onun qabağına qaçaram.

Qardaş demə, qan olar,
Yel əsər, fəqan olar.
Qardaş gələn yollara,
Bacılar qurban olar.

Rəşadətsiz bilin ki, bacılarının canından can ayrılıb. Həmişə onunla fəxr edərdik, indi də fəxr edirik. Qardaşım Rəşadət vətənimiz uğrunda canından keçib. Allah qalan qardaşlarımı, xalqımızı qada-bəladan qorusun. Bir daha müharibə olmasın. Xalqımız həmişə firavan yaşasın. Övladlarımız, nəvələrimiz xoşbəxt böyüsünlər.

*31.08.2023*

**Şahvələd Piriyev**
*Rəşadət Piriyevin qardaşı*

## QARDAŞIMLA FƏXR EDİRƏM

Qardaşım Rəşadət ailəmizin sonbeşiyi idi. Evimizdə hamı onu çox istəyirdi. Ağıllı, üzüyola, sadə, mədəni bir uşağıydı. Hara buyursan ürəklə gedər, hər işin də öhdəsindən gələrdi. Adamı layiqincə yarıdardı. Elə oldu ki, orta məktəbi qutaranda artıq Qarabağda döyüşlər başlayırdı. 1992-ci ildə Rəşadəti hərbi komissarlığa çağırıb əsgərliyə apardılar. Bir də eşitdik ki, onu göndəriblər Laçın cəbhəsinə, orada döyüşlərdə iştirak edir. Oradan sonra Kəlbəcər döyüşlərində də iştirak etdi. Özü də onların Kəlbəcərdə çox ağır döyüşləri olmuşdu. Kəlbəcər işğal olunandan bir neçə ay sonra onun xidmət etdiyi taboru Ağdam cəbhəsinə göndərdilər.

1993-cü ilin avqust ayı idi. Xəbər gəldi ki, Rəşadət Ağdam rayonunda gedən döyüşlərdə yaralanıb. Bir həftə Bərdə xəstəxanasında müalicə olundu. Müalicədən sonra da kürəyində qəlpə yarası, başında və alnında çapıqlar qalmışdı. Onu xəstəxanadan evə yazmışdılar. Bir həftə də evdə müalicə götürdükdən sonra yenə də döyüşçü yoldaşlarının yanına qayıtdı. Bərdə batalyonu Ağdamdan bir də Kəlbəcərə gedəndə yoldaşlarının çağırışı ilə yenə də döyüşlərdə iştirak etmək üçün getdi. Həmin gün işdən evə gəldim ki, yoxdu, gedibdi.

Onu da deyim ki, həmin müharibə vaxtlarında qardaşım Rəşid də Ağdərə döyüşlərində iştirak edirdi. Mən özüm də hərbi komissarlıqda sürücü kimi qeydiyyatda idim. İşlədiyim Bərdə 1 №li Tikinti Quraşdırma İdarəsindən hərbi

komissarlığın müraciəti əsasında dövlət qeydiyyat nişanı 50–88 АГР olan qoşqulu “Kamaz” markalı yük maşını ilə silah-sursatın daşınmasında xidmətə göndərilirdim. Uzundərədən və başqa hərbi bazalardan dəfələrlə Metsşen (Ulu Qarabəy), Heyvalı (Drombon), Ağdərə (Mardakert), Ağcakənd (Şaumyanovsk) cəbhələrinə silah-sursat daşımışam. Hətta 1991-ci ildə işlədiyim Bərdə 1 №li TQİ-dən Xocalıdakı 23 №li TQİ-yə göndərilirdik. Xocalıda “Finski” evlərin tikintisində yaxından iştirak etmişəm. Ora demək olar ki, bütün tikinti materialları və eləcə də işçi qüvvəsi Bərdədən gedirdi.

Təvazökarlıqdan uzaq olsa da deməliyəm ki, biz vətənə, xalqa bağlı ailəyik. Qardaşım Rəşadət 11 fevral 1994-cü ildə Vətən yolunda, onun azadlığı uğrunda şəhid oldu.

Allah bütün Azərbaycan şəhidlərinə rəhmət eləsin. Mən qardaşımla fəxr edirəm. Vətən sağ olsun.

*Yeni Daşkənd, 24.08.2023*

**Şahsuvar Piriyev**
*Rəşadət Piriyevin qardaşı*

## QƏRİBƏ HİSS KEÇİRDİRƏM

Xoşbəxt illərimiz vardı. Atalı, analı, qardaşlı, bacılı günlərimiz. Ailəmiz böyük olduğundan çox mehribançılığımız vardı. Can deyib, can eşidirdik. Qardaşım Rəşadət də kiçiyimiz olduğundan hamımızın sevimlisi idi. Qapıda nə iş görsəm əlimdən tutardı. Hər çətin işə özünü verən oğlanıydı. Bir dəfə də yadıma gəlmir ki, harasa buyurasan deyə ki, mən getmirəm.

Qarabağ müharibəsi başlayanda qardaşım Rəşid özünümüdafiə batalyonunda döyüşürdü. Sonralar Rəşadəti də Bərdədən əsgərliyə çağırdılar. O, da getdi. Çox cəbhələrdən yaxşı döyüşçü kimi səsi-sorağı gəlirdi. Həm narahat idik, həm də sevinirdik ki, adlı-sanlı qəhrəman döyüşçüdü. Ağdamda yaralanmışdı. Bərdə xəstəxanasında müalicə olundu. Bu haqda məndə həkimin bir arayışı da var. O illərdən xatirə kimi hələ də saxlayıram. Müalicələrdən sonra briqadaları Murovdağa döyüşə gedəndə Rəşadət də qalmadı, getdi. Elə o gedişdən də sonra daha onu görə bilmədik. 11 fevral 1994-cü ildə Kəlbəcər döyüşlərində itkin düşdü.

Birdən görürsən ki, televiziyada itkinlərlə bağlı verilişlər olur. Beynəlxalq Qızıl Xaç və Qızıl Aypara Cəmiyyətindən deyirlər ki, girovları dəyişirik. Həmin an adam özündə bir hiss keçirdir ki, bəlkə elə qardaşımın da adı çəkiləcək. Bəlkə elə bu dəyişdirilən qardaşım olacaq. Adı eşidənə qədər adam özündə qəribə bir hiss keçirdir. Nə bilim, yenə də, Allaha pənah. Allah prezidentimizə dəyməsin. Girovlarımız dəyişdirilsin. Bizi kimi qardaşlar, atalar,

analar, bacılar da sevinsin. Həmişə öz-özümə düşünürəm ki, nə ola qardaşım Rəşadət qayıda gələ, qurban kəsək, sevinək, birlikdə deyək-gülək. Ona toy edək. Bütün kənd camaatımızla birlikdə şənlənək.

Qardaşım Rəşadətin adını indi ailəmizdə nəvəm Əbilov Rəşadət Elçin oğlu yaşadır. Arzu edirəm ki, nəvəm Rəşadət vətəninə, xalqına gərəkli övlad olsun.

Allah xalqımızı qorusun.

*Yeni Daşkənd, 30.08.2023*

**Rəşid Piriyev**
*Bakı Şəhər Baş Polis İdarəsinin*
*Dövlət Yol Polisi İdarəsinin rəisi,*
*Polis polkovnik-leytenantı,*
*Rəşadət Piriyevin qardaşı*

## SƏN HƏMİŞƏ QƏLBİMİZDƏSƏN

Yaxşı xatırlayıram, Dağlıq Qarabağ məsələsi meydana çıxanda mən sovet ordusunda xidmət edirdim. Təzəcə xidməti başa vurub gəlmişdim. O vaxtı hamı özünümüdafiə batalyonlarına könüllü qoşulurdu. Mən də elə etdim. Hərdən bir evə gələndə baxırdım ki, kiçik qardaşım Rəşadət hərbi geyimimə, silahıma çox maraqla baxır. O məndən 2 yaş kiçik idi. Onda hələ onun həqiqi hərbi xidmətə çağırılma vaxtı deyildi. O dövrdə hər kəs kimliyindən asılı olmayaraq vətənin ərazi bütövlüyünü qorumağa qalxırdı. Gənclərdə çox böyük ruh yüksəkliyi vardı. 1992-ci ilin əvvəlləri idi. Qardaşım Rəşadət də könüllü gedib Bərdə batalyonuna yazılmışdı. Ona bir-iki dəfə dedim ki, olmaz, anam evdə təkdi, sən qayıt ki, anam da tək qalmasın. Gördüm ki, yox, qardaşım fikrindən dönmək istəmir. Həm də Rəşadət elə bir xarakterin yiyəsi idi ki, dediyindən dönmürdü. Yaş fərqimiz az olduğundan uşaqlığımız bir yerdə keçib. Ona görə də xasiyyətinə yaxşı bələd idim. Qayğısız, xoşbəxt illərimiz çox olub. Biz digər kənd uşaqları kimi zəhmətlə böyümüşük. Ailəmiz də böyük olub. Rəşadət 7 qardaş-bacının kiçiyi idi. Nəysə, o, təkid edirdi ki, xidmətə gedəcəm. Açığı onun bu inadına sevindiyimdən, mane olmadım. Beləcə, iki qardaş döyüşlərdə aktiv iştirak edirdik. Amma, ayrı-ayrı cəbhələrdə döyüşürdük. Sonra könüllülər batalyonu ləğv

olunanda mən sənədlərimi Ağdərə Rayon Polis Şöbəsinə verdim. Ağdərə rayonu döyüş bölgəsi olduğuna görə oranı seçdim ki, döyüşlərdə yenə də iştirak edim.

1993-cü ilin avqust ayı idi. Mən Ağdərə cəbhəsində polis sıralarında döyüşlərdə olanda eşitdim ki, Rəşadət Ağdam döyüşlərində yaralanıb. Gəlib onunla Bərdə xəstəxanasında görüşdüm. Başından, qolundan, bir də kürəyindən yaralı idi. Bir müddət müalicə keçdi. Sonra həkim onu evə yazdı ki, müalicəsini evdə davam etdirsin. Həm də həkimi demişdi ki, daha döyüşə getməsin, tərxis olunsun. O, bunu biləndə heç cürə razılaşmadı. Həkimə dedi ki, mən xidmətə davam edəcəm. Düzü mən də təkidlə desəm də ki, qal evdə, qalmadı. Hətta müalicəsi tam bitməmiş taborları Murovdağa qayıdanda Rəşadət də onlara qoşulub döyüşlərə getdi. İndi o günləri çox yaxşı xatırlayıram. Mən onu yaralanandan sonra aktiv döyüşlərdən saxlamaq istəyəndə mənə belə demişdi: “Məni yaralananda döyüş bölgəsindən çıxaran oğlanlar şəhid oldu. Sən də məni hərbidən uzaqlaşdırmaq istəyirsən. Digər qardaşlarım nə də desə onlardan bir belə incimərəm. Axı sən döyüş görübsən. Mən də döyüşçüyəm. Yoldaşlarımdan ayrı necə qalım”. Bu sözlərdən sonra ona ümumiyyətlə ayrı söz demədim. O çox düz deyirdi. Həqiqətən də belə götürəndə hər birimiz bu torpağın oğluyuq. Nə qədər canımızda can var torpaq üçün onu itirməyə belə hazır olmalıyıq. Onun mənə dediyi ağıllı sözlərinə görə alqışladım. Dedim ki, səni Allah qorusun. Sən Kəlbəcər zonasında, mən də Ağdərədə döyüşək. Qismət Allahdan, yəqin ki, Sərsəng su anbarı azad olunanda siz o tərəfdən, biz də bu tərəfdən gəlib ortada görüşəcəyik.

Mən çatdırıb onun xidmət etdiyi taborla demək olar ki, əlaqə saxlaya bilmirdim. Həm dostlarıma görə, həm də qar-

daşıma görə narahat idim ki, bunlar hardadı. Hər gün irəliləyiş vardı. Doğrudan da o vaxtkı hərbi birləşmələrdə qeyri-adi ruh yüksəkliyi vardı. Hər bir əsgərin böyük vətən eşqi digərlərində ruh yüksəkliyi yaradırdı. Döyüşdən-döyüşə həvəslə gedirdilər. Çox həvəslə Azərbaycan ordusu irəli gedirdi.

Qardaşım məndən kiçik və təcrübəsiz olmasına baxmayaraq qısa müddətdə elə bir nailiyyətlər əldə etmişdi ki, onun komandirləri, döyüşçü yoldaşları Rəşadətdən ağızdolusu danışırdılar.

Bir çox döyüşlərdə qəhrəmanlıqlar göstərən qardaşım 1994-cü ilin fevral ayında Murovdağda şəhidlik zirvəsinə ucaldı. Ruhun şad olsun, əziz qardaşım. Sən həmişə qəlbimizdəsən. Bir an belə xəyalımızdan, gözümüzün önündən getmirsən. Hər zaman bizimləsən. Bil ki, qanın tökülən Qarabağ torpaqları indi azaddır. Üçrəngli Azərbaycan bayrağı uğrunda şəhid olduğunuz torpaqlarda, yüksəkliklərdə dalğalanır. Yaşasın Azərbaycan, yaşasın Qarabağ, yaşasın xalqımız.

Rəşadətlə həm qardaşım kimi, həm də bir döyüşçü kimi fəxr edir, qürur hissi keçirirəm. Onun kimi Azərbaycanın ərazi bütövlüyü uğrunda canından, qanından keçən hər bir vətən övladı üçün də fəxr edirəm. Hər birinin ruhu qarşısında baş əyirəm.

*Bakı, 25.08.2023*

**Tərtibçidən:** *Hörmətli oxucular, şəhid Rəşadət Piriyevin özündən böyük qardaşı Rəşid Piriyev də Birinci Qarabağ müharibəsində bir çox yaşayış məntəqələrimizin erməni işğalından azad olunmasında yaxından iştirak etmiş-*

*dir. Burada Rəşid Piriyevin həyat və fəaliyyəti haqqında qısa da olsa məlumat vermək istərdik.*

**Piriyev Rəşid Əli oğlu** 25 yanvar 1971-ci ildə Bərdə rayonunun Yeni Daşkənd kəndində doğulmuşdur. 1978–1988-ci illərdə Yeni Daşkənd kənd orta məktəbində oxumuşdur. 1993–1995-ci illərdə DİN-in Polis Akademiyasının nəzdində Xüsusi Orta Polis məktəbində, 2006–2009-cu illərdə isə DİN-in Polis Akademiyasında hüquqşünas ixtisası üzrə ali təhsil almışdır.

19 may 1989-cu ildən 31 may 1991-ci ilədək İrkutsk vilayətinin Anqarsk şəhərində sovet ordusu sıralarında hava hücumundan müdafiə qoşunlarında həqiqi hərbi xidmət keçmişdir.

Rəşid Piriyev 1991–1992-ci illərdə könüllü olaraq milli ordu sıralarında Qarabağ döyüşlərində iştirak etmişdir. 1992–1993-cü illərdə isə Ağdərə Rayon Polis şöbəsinin baş çavuşu kimi ən qaynar nöqtələrdə döyüşmüşdür. Ağdam, Ağdərə, Ağcakənd, Kəlbəcər cəbhələrində, xüsusilə Ağdərə rayonunun bir çox kəndlərində gedən qanlı döyüşlərin iştirakçısı olmuşdur.

Qarabağ müharibəsi veteranıdır.

Rəşid Piriyev 1995–2001-ci illərdə Ağdam Rayon Polis Şöbəsinin polis sahə inspektoru, 2001–2005-ci illərdə Bərdə RPŞ-nin Cinayət Axtarışı bölməsində axtarış üzrə əməliyyat müvəkkili, 2005–2006-cı illərdə Balakən RPŞ-nin Cinayət Axtarışı bölməsində əməliyyat müvəkkili, 2006–2007-ci illərdə Balakən RPŞ-nin Cinayət Axtarışı bölməsinin rəisi, 2007–2009-cu illərdə Cəlilabad RPŞ-nin Cinayət Axtarışı bölməsinin rəisi, 2009–2011-ci illərdə Astara RPŞ-nin Qeydiyyat və şəxsiyyət vəsiqəsi bölməsinin rəisi,

2011–2012-ci illərdə Salyan RPŞ-nin Təhqiqat qrupunun təhqiqatçısı, 2012–2013-cü illərdə Sabirabad RPŞ-nin Cinayət Axtarışı bölməsində axtarış üzrə əməliyyat müvəkkili və axtarış üzrə baş əməliyyat müvəkkili, 2013–2016-cı illərdə Gəncə şəhəri Nizami RPİ-nin Cinayət Axtarışı bölməsinin bölmə rəisi, 2016–2018-ci illərdə Şirvan ŞPŞ-nin Cinayət Axtarışı bölməsinin bölmə rəisi və xidmət üzrə rəis müavini, 2018–2019-cu illərdə isə Beyləqan RPŞ-nin rəisi kimi məsul vəzifələrdə çalışmışdır.

18 oktyabr 2019-cu ildən Bakı Şəhər Baş Polis İdarəsinin Dövlət Yol Polisi İdarəsinin rəis müavini, 7 yanvar 2020-ci ildən rəis vəzifəsini müvəqqəti icra edən, 15 yanvar 2020-ci ildən isə idarə rəisi vəzifəsində işləyir.

Azərbaycan Respublikası Prezidentinin sərəncamı ilə polis polkovnik-leytenantı Piriyev Rəşid Əli oğlu "İgidliyə görə" medalı (29.06.2019) ilə təltif olunmuşdur.

EL TV "Əsgər" verilişinin 2017-ci il tarixli "Döyüş yolu" rubrikasında Rəşid Piriyevin həyatı və döyüş yolu haqqında sənədli film yayımlamışdır.

**Araz Yaquboğlu**
*Azərbaycan Jurnalistlər Birliyinin və*
*Azərbaycan Aşıqlar Birliyinin üzvü,*
*Rəşadət Piriyevin sinif yoldaşı*

## RƏŞADƏTLİ RƏŞADƏT

*Elə yaşamalısan ki, öləndən sonra da öl-*
*məyəsən – həyatın məqsədi məhz budur.*
***Cəlil Məmmədquluzadə***

Bu il 1973-cü il təvəllüdlü həmyaşıdlarımın 50 illik yubileyi ilidir. 1980-ci ildə Yeni Daşkənd kənd orta məktəbində ibtidai təhsil almağa başladıq. İki sinifdə 50 uşaq idik. Onun 25-i qız, 25-i isə oğlanıydı. Oğlanların 14-ü Birinci Qarabağ müharibəsində iştirak etdi. Onlardan 6-sı şəhidlik zirvəsinə ucaldı. Eyni məktəbdə və eyni sinifdə oxuyan 6 məzunun şəhid olması bəlkə də Azərbaycanda yeganə göstəricidir. Bu il onlardan Qulamın, Elçinin, Yasifin, Mehdinin və Ziyanın anadan olmasının 50 illiyi qeyd olundu. Şəhidlərin yubiley tədbirlərinin keçirilməsi kəndimizdə artıq ənənə halını alıb. Bu, çox yaxşı örnəkdir. Oktyabr ayının 1-də isə 6-cı şəhid sinif yoldaşımız Rəşadətin yubileyi doğulduğu Yeni Daşkənd kəndində qeyd olunacaq.

Rəşadət Piriyev çox sadə bir oğlan idi. Çünki o, zəhmətkeş bir ailədə doğulmuşdu. Atası Əli dayı, anası Sədət xala övladlarını halal zəhmətləri ilə böyütmüş, onlara nümunə göstəriləcək təlim-tərbiyə vermişdilər. Rəşadət ailədə böyüyən 7 övladın kiçiyi, son beşiyi idi. O özü də böyük qardaş-bacılarından necə olmağı göz yaddaşı, iti təfəkkürü ilə mənimsəmişdi. Onun qardaşları kənddə hamının hörmət bəslədikləri şəxslərdir. O hörməti də şəxsən özləri qazanıblar. Heç vaxt heç kim bu qardaşların bir xoşagəlməz hərəkətini görməyib, eşitməyib. Bu ailə mədəniyyətlərinə,

sadəliklərinə, qayğıkeşliklərinə, zəhmətkeşliklərinə, səmimiyyətlərinə görə nümunə göstəriləcək bir ailədir.

Dediyim kimi, bizim yaşıdlar "a" və "b" siniflərinə bölünməklə məktəbdə orta təhsil alırdıq. 1990-cı ildə məktəbdən məzun olduq. "a" sinfindən Yasif, Qulam, Elçin, "b" sinfindən isə Mehdi, Ziya və Rəşadət şəhidlik zirvəsinə ucaldılar. Bunların hər biri çox vətənpərvər, el-obaya, yurda bağlı uşaqlar idilər. Çünki bizim Yeni Daşkəndlilər hələ 1953-cü ildə tarixi Azərbaycan torpağı olan Göyçə mahalının Daşkənd kəndindən deportasiya olunublar. Ona görə də bu kəndin hər bir sakini doğma yurd-yuva itirməyin acısını çox dadıblar. Yeri gəlmişkən, onu da qeyd edim ki, bu il may ayının 21-də Yeni Daşkənd kəndinin yaranmasının 70 illik yubileyi respublika səviyyəsində keçirildi. Məhz Qarabağ münaqişəsi ciddi müharibəyə çevriləndə Yeni Daşkəndlilər özünümüdafiə batalyonlarına qoşulan ilklərdən oldular. Onlardan biri də Rəşadətin özündən böyük qardaşı Rəşid Piriyev idi. Əsgəran rayonunun Naxçıvanik (indiki Naxçıvanlı) kəndindəki ağır döyüşlərin iştirakçısı olan Rəşid Ağcakəndin, Ağdərənin düşmənlərdən azad olunmasında fəal iştirak etmişdir. Onun döyüşçü yoldaşları bu gün də Rəşid Piriyevin tankın üstündə cəsur bir qəhrəman kimi Ağcakəndə daxil olduğunu çox yaxşı xatırlayırlar.

Qarabağ müharibəsi illərində qeyri-rəsmi də olsa belə bir qayda vardı. Əsasən bir ailədən aktiv döyüşdə iştirak edən vardısa o ailədən ikinci övlad müharibəyə cəlb edilmirdi. Lakin buna baxmayaraq, Rəşadət 1992-ci ilin əvvəllərində Bərdə RHK-na müraciət edərək döyüşlərdə iştirak etmək istəyini bildirmişdi. Hərbi xidmətə Bakıda başlayan Rəşadət Piriyev karantin müddəti qurtaran kimi 701 saylı briqadanın tərkibində Laçın cəbhəsinə göndərildi və Hoçazda döyüşlərə başladı. Rəşadət bir müddət xidmət etdikdən sonra elə Laçındaca 5-ci Bərdə taboruna köçürülmüş,

ən gərgin mövqelərdə xidmət göstərmişdir. Laçının şimalındakı döyüşlərdən sonra Rəşadət döyüşçü yoldaşları ilə bərabər Kəlbəcərin bir çox kəndlərindəki əməliyyatlarda iştirak etmişdir. Rəşadətin döyüşçü yoldaşları, komandirləri onun hərbi bacarığı haqqında bu gün də fəxarətlə danışırlar.

5-ci Bərdə taboru nümunəvi döyüş yolu keçdiyindən Ağdam cəbhəsində vəziyyət ağırlaşanda Rəşadətin xidmət etdiyi həmin tabor Murovdağ cəbhəsindən çıxarılaraq ora göndərilir. 1993-cü il avqustun 21-də Sarıcalı kəndində Rəşadət qolundan və kürəyindən qəlpə yarası alır. O, Bərdə şəhər xəstəxanasına yerləşdirilir. Bu döyüşdən dörd gün sonra Rəşadət Piriyevi minamyot atəşi altından yaralı halda xilas edən həmkəndlisi Eldəniz Nəzərov şəhid olur. Rəşadət yaralı olsa da düşməndən Eldənizin qanını alacağına and içir.

Rəşadətin xidmət etdiyi 5-ci Bərdə taboru Ağdam cəbhəsindən yenidən Murovdağa göndəriləndə müalicəsini tam qurtarmadığına baxmayaraq, o da xidmətə qayıtmışdır. Bu zaman Rəşadət həm də rabitə üzrə kurs keçərək rabitəçi peşəsinə yiyələnir. İkinci Kəlbəcər əməliyyatında yenə də əvvəlki ruh yüksəkliyi ilə döyüşür. Çox ağır döyüşlərin iştirakçısı olur. Adı kimi rəşadət göstərir. Qızılqaya yüksəkliyi azad olunanda həmkəndlisi və döyüşçü yoldaşı şəhid Eldəniz Nəzərovun qanını alır. Döyüşçü yoldaşları ilə birlikdə düz 57 erməni qanına qəltan edirlər.

İki ilə yaxın davamlı döyüşlərdə aktiv iştirak edən Rəşadət Piriyevin xidmətdə olduğu strateji mövqe 11 fevral 1994-cü ildə düşmən ordusu tərəfindən mühasirəyə alınır. Ona və döyüşçü yoldaşlarına ermənilər tərəfindən təslim olmaq haqda təklif olsa da, "Biz düşmənə sağ can verməyik", – deyərək son damla qanına, son gülləsinə qədər döyüşmüş, qəhrəmanlıqla şəhid olmuşdur. Şəhid olduğu mövqe ermənilər tərəfindən tutulduğundan onunla birlikdə şə-

hid olan döyüşçü yoldaşlarının nəşini götürmək mümkün olmamışdır. 2020-ci ildəki İkinci Qarabağ müharibəsindəki şanlı qələbəmizdən sonra inanıram ki, onun, eləcə də digər itkin-şəhidlərin kütləvi məzarlıqlardan bədən qalıqları tapılacaq və dəfn olunacaqlar. Rəşadətlə bərabər inşallah ki, digər sinif yoldaşlarımız Mehdi və Ziyanın da yeri məlum olar və doğma Yeni Daşkənd qəbiristanlığında dəfn olunarlar. Bununla da qulaqları səsdə, gözləri yollarda bu fani dünyanı nigaran tərk edən valideynlərinin də ruhları rahatlıq tapar, şad olar. Qədirbilən camaatımız da hər zaman onların məzarını ziyarət edər, müqəddəs ruhlarına dualar oxuyarlar. Allah şəhidlərimizə rəhmət eləsin.

Bütün Azərbaycan şəhidləri kimi Rəşadətin də hər il doğum və şəhid olduğu gün ailəsi, doğmaları və döyüşçü yoldaşları tərəfindən qeyd olunur. Onun şəkli rəhmətlik ata və anasının məzar daşına həkk olunmuşdur. Eyni zamanda, 2021-ci ildə Yeni Daşkənd kəndində tikilmiş möhtəşəm "Vətən şəhidləri abidəsi"nə də barelyefi vurulmuşdur.

Yevlax şəhərində yayımlanan televiziya kanalı EL TV-nin "Əsgər" verilişinin 20 noyabr 2017-ci il tarixli "Şəhidlər" rubrikasında Rəşadət Əli oğlu Piriyevin həyatı və döyüş yolu haqqında 24 dəqiqəlik sənədli film yayımlanmışdır.

Türkiyənin AC AMAS şirkəti Afrika qitəsində yerləşən Kamerunda Rəşadətin xatirəsinə su quyusu inşa etmiş, susuzluqdan əziyyət çəkən müsəlmanların istifadəsinə vermişdir. Su quyusunun dərinliyi 70 metrdir. 2020-ci ildə açılışı olmuşdur. Xatirə lövhəsinə *"Karabağ şehidi Ali oğlu Reşadet Piriyev su kuyusu"* sözləri yazılmışdır.

Ruhun şad olsun, əziz sinif yoldaşım Rəşadət. Sən döyüşlərdə adına layiq rəşadət göstərərək rəşadətli Rəşadət adını qazandın.

*Bakı, 24.08.2023*

**Vüqar Əhməd**
*şair, ədəbiyyatşünas, alim*

## RƏŞADƏTLİ RƏŞADƏT

*Polkovnik dostum Rəşid Piriyevin I Qarabağ savaşında şəhid olmuş qardaşı Rəşadətin əziz xatirəsinə ithaf.*

Ömrünün gül açmış gənclik çağında,
Vətən sevgisilə qalxıb savaşa,
Torpağın qoynunda sən başdan-başa,
Öz şəhid qanınla çiçəklər əkdin,
Düşməni atəşli məzarə çəkdin.

Halal süd əmmişdin Sədət anadan,
Boy-qamət vermişdi sənə Yaradan,
Güc-qüvvət alırdın eldən-obadan,
Yüzlərlə düşmənin qanını tökdün,
Şəhidim, hamının belini bükdün.

Savaşlarda göstərirdin şücaət,
Səndə vardı heyrətamiz rəşadət,
Hey Cənnətdə ruhun edir səyahət,
Bərdə taboruyla döyüşə gəldin,
Düşmənə savaşda göz dağı verdin.

Döyüş yerlərindi Kəlbəcər, Laçın,
Zəngəzur, Qarabağ oldular qaçqın,
Ay Allah: – bu dərdi mən kimə açım?
Qəlbində yanğıyla belə deyirdin,
Gələcək zəfəri o vaxt görürdün.

Səndə vardı fövqəladə mətanət,
Ruhun rəşadətli, özün Rəşadət,
Uca Allahıma edib ibadət,
Qardaşın Rəşidlə sancdın bayrağı,
Qorudun Vətəni, ulu torpağı.

Savaşdın düşmənlə qorxu bilmədən,
Atıldın döyüşə – yaralı bədən,
Sən şəhid olsan da qəfil gülədən,
Müthiş cürətinlə yaxdın düşməni,
Doğma Azərbaycan unutmaz səni.

İtkin düşsə də məzarın sənin,
Ümidlər çırağın sönmədi sənin,
Yenə işıqlandı güldü Vətənin,
Ey şəhidim, fəda etdin canını,
Torpağın uğrunda tökdün qanını.

İnanırdın yenə xoş gün gələcək,
Ağdam, Şuşa, Kəlbəcərin güləcək,
Qarabağın gülüstana dönəcək,
Artıq oxunacaq Zəfər nəğməsi,
Tam olacaq Vətənin xəritəsi.

Əli oğlu ocağın, soyadın Piri,
Rəşadər ölməyib, diridir-diri,
Ordunun aslanı, ordunun şiri,
Bu Vətəni yenə eylədiz xoşbəxt,
Artıq bizimlədir daim səadət.

Eşit, ey şəhidim, sən məni eşit!
Sənsiz pərişandır qardaşın Rəşid,
Məzarın üstündə gül çeşid-çeşid,
Doğmalar göz yaşı tökürlər sənə,
Adın xatırlanır hey dönə-dönə.

İlhamla qaytardıq biz Qarabağı,
Dəmir yumruq verdi gözəl növrağı,
Artıq dünya seçir qaradan-ağı,
İgid Rəşadətin çoxdur şöhrəti,
Qələmə sövq etdi Vüqar Əhmədi.

*12.09.2023*

**Aqşin Hacızadə**
*Qarabağ müharibəsi veteranı,
Ziyafət Balıyev adına Yeni Daşkənd
kənd folklor evinin bədii rəhbəri, şair*

## MƏZARI OLMAYAN ON BEŞ QƏHRƏMAN
***(poema)***

*Poema 1993-cü ilin sonu, 1994-cü ilin əvvəllərində keçirilmiş "İkinci Kəlbəcər əməliyyatı"nda (Meydançay əməliyyatı), 11 fevral tarixində dumanlı hava şəraitində, arxa cəbhədən kömək olmadan saatlarla erməni və rus birləşmələrinə qarşı qəhrəmancasına döyüşərək şəhid olan, ölümündən sonra cəsədləri döyüş meydanında qalan 5-ci Bərdə taborunun rabitəçisi Rəşadət Əli oğlu Piriyevə və onun şəhid silahdaşlarının rəşadətli döyüş yoluna həsr olunur.*

Səninlə fəxr edib, öyünnəm yenə,
Çox kəndlər içində adın-sanın var.
Min dəfə eşq olsun ey kəndim sənə,
Bu qədər şəhidin, qəhrəmanın var.

Hansından söz açıb, mən yazsam əgər,
Hər biri tutarlı bir əsər olar.
Qarabağ işğala tuş gələn illər,
Bir tarix yazıblar qan ilə onlar.

Onların keçdiyi döyüş yolunda,
Hər addımbaşında ölüm durubdu.
Güllələr uçuşub hey sağ-solunda,
Durduğu səngəri mərmi vurubdu.

Tək mənfur düşmənlə döyüşməyiblər,
Hər anda döyüşüb ölümlə onlar.
Ötəcək fəsillər, neçə yüz illər,
Tarixdə qalacaq bu qəhrəmanlar.

Onlardan biridir bax bu qəhrəman,
Onlardan biridir igid Rəşadət.
Mən şair borcumdur, ondan bax bu an,
Söyləyim sizlərə bir az, nəhayət.

Bu eldə, obada o, adlı-sanlı,
Pirilər nəslinin yetirməsiydi.
İgid böyümüşdü bu dəliqanlı,
Vətənin dar günə haray səsiydi.

Arzusu böyükdü getsin hərbiyə,
Vətənə sevgisi gəlirdi qandan.
O belə almışdı təlim-tərbiyə,
Atası Əlidən, Sədət anadan.

Qarabağ savaşı başlayan andan,
Döyüşür cəbhədə qardaşı Rəşid.
İstəyir geridə qalmasın ondan,
Bu cəsur Rəşadət, bu bizim igid.

Onsəkkiz yaşını yeni ötüncə,
Xidmətə getmişdir çox həvəs ilə.
İlk gündən top-tüfəng, döyüş görüncə,
O qorxu duymamış bir an da belə.

Bərdədən Bakıya göndərilsə də,
Laçından başlamış ilk döyüş yolu.
Əvvəldən sonadək, onun hər vədə,
Olmuşdur bu yolu mərdliklə dolu.

Rəşadət döyüşmüş Şamkənd, Fərraşda,
Doxsanikinci ilin sərt qış çağında.
Döyüşüb düşmənlə qayada, daşda,
Minkənddə, Qırxqızda, Hoçaz dağında.

Sonralar Bakıya göndərilsə də,
Dəyişib hissəni, dönmüş Laçına.
Xidmətə gəldiyi hərbi hissədə.
Təəccüb etmişlər o zaman ona.

Bəzisi cəbhədən qaçdığı halda,
Rəşadət cəbhəyə qayıtmış özü.
“Mən qala bilmərəm cəbhədən dalda”,
Hamının önündə bu olmuş sözü.

Can atmış hər zaman, hər bir anda o,
Zəfərə, uğura yol açmaq üçün.
Elə bil anadan doğulanda o,
Doğulmuş düşmənlə savaşmaq üçün.

Yox, savaş etməyib təkcə Laçında,
Şərəflə döyüşüb hər bir yerdə o.
Kəlbəcər işğala məruz qalanda,
Taborla olmuşdur Kəlbəcərdə o.

Döyüşmüş beşinci Bərdə taboru,
Adlanan o məşhur öz hissəsində.
Olmuşdur onun da böyük uğuru,
Kəlbəcər elinin təxliyyəsində.

Ağırdı, çətindi burda döyüşmək,
Ruzigarın qarlı, o sərt çağında.
Bu vətən uğrunda şəhid verərək,
Döyüşmüş taborla Murov dağında.

Rəşadət döyüşmüş orda cürətlə,
Var bu gün həyatda çox buna şahid.
O çətin döyüşdə bir çox əsgərlə,
Komandir Tahir də olmuşdur şəhid.

İtkisi, şəhidi çox olub bu ay,
Yenilik gərəkdir indi taborda.
Qərargah rəisi Əsədov Gəray,
Komandir seçilir tabora burda.

Kəlbəcər işğala məruz qalanda,
Yerləşir bu tabor Murov dağında.
Camışdağ taborun qalır solunda,
Koroğlu, Hinaldağ, Ömər sağında.

Bir neçə ay keçir, Ağdam cəbhəsi,
Gərgindir, ordudan kömək gözləyir.
Ordunun “N” saylı hərbi hissəsi,
Taboru Ağdama kömək göndərir.

Ağdamın Çəmənli, Sarcalı kəndi,
Olubdu taborun döyüş postları.
Ağırdı düşmənin qurduğu fəndi,
Ağdamdan tuş alır ağdamlıları.

Avqustun iyrimi bir tarixində,
Qəfildən hücuma keçir düşmənlər.
Güllələr uçuşur səngər içində,
Yağıştək göylərdən yağır mərmilər.

Bir sınaq günüdür sanki bax bu gün,
Gərəkdir bu səngər keçməsin ələ.
Bu düşmən həmləsin dəf etmək üçün,
Rəşadət döyüşür rəşadət ilə.

Ən böyük zirehi beretka olub,
Düşməyib başından yayda, nə qışda.
Elə bil poladdan zirehdir, qoyub,
Döyüşür bu an da beretka başda.

Bir mərmi partlayır bu an sağında,
Çatdıra bilməyir döyüşü sona.
Döyüşün çox ağır, gərgin çağında,
Minamyot qəlpəsi tuş gəlir ona.

Bizim bu qəhrəman, igid Rəşadət,
Çiynindən, alnından yaralanıbdır.
Mərminin gücündən sümükdən fəqət,
Çiyninin əti də aralanıbdır.

Onunla bərabər döyüş yoldaşı,
Etibar Cəfərov alıbdır yara.
İtirə bilməzlər cüt silahdaşı,
İlk yardım gərəkdir mütləq onlara.

Eldəniz, Qəzənfər, Elxan qol-qola,
Götürür onları geri, cəbhədən.
Etibar Bakıya salınır yola,
Bərdəyə yollanır Rəşadət həmən.

Cəbhədən o qədər deyil aralı,
Ya Ağdam, ya olsun Tərtər arası.
Buraya hər yerdən gəlir yaralı,
Doludur Bərdənin xəstəxanası.

Beş saat vaxt çəkir əməliyyatı,
Döyüşdə aldığı yaralarıyla.
Rəşadət ayılır günün sabahı,
Anası Sədətin göz yaşlarıyla.

Yaralı olduğun eşidib dünən,
Axşamdan burdadır bütün doğmalar.
Sağalsın, yaşasın deyə hər gələn,
Rəşadət adına edir dualar.

Oğlunu itirmək qorxusu ilə,
Çox təlaş keçirir anası Sədət.
Rahatlıq tapmayır bircə an belə,
Düşünür, bəs birdən ölər Rəşadət!

Qardaşdı bacının başının tacı,
Var onun qardaşa çox məhəbbəti.
Ağlayır, yalvarır Tərcüman bacı,
“Ay Allah, sən qoru, sən, Rəşadəti!”

Bir aydan çox olar getdiyi vədə,
Gəlməyib döyüşdən o vaxtdan bəri.
Döyüşür qardaşı Rəşid cəbhədə,
Əlbətdə bu işdən yoxdu xəbəri.

Dilindən düşməyir Sədət ananın,
Dualar eyləyir Rəşid üçün də.
Deyir ki, “Dönəcək balam zəfərlə”,
Var inam, var ümid onun içində.

Səhəri açıblar ayaq üstündə,
Şahmurad, Şahvələd, Şahsuvar burda.
Onların yanında, bu ağır gündə,
Onlarla bərabər bir el var burda.

Çox şükür, Rəşadət ayılır daha,
Görüncə anasın, “Ay ana” deyir.
Sevinib ağlayır, göydə Allaha,
Şükr edir, anası, “Can”, ona deyir.

Eşidib səsini bu el oğlunun,
Orada kimlər var, gözləri dolur.
Salamat görüncə bu işin sonun,
Sevinir dost-qohum, hamı şad olur.

Diləyib sağlığı biz Rəşadətə,
Qayıdaq Ağdama, dönək cəbhəyə.
Gələcək nəsilə, həm bu millətə,
Mən yazım sonralar nə olmuş deyə.

Ötüşür aradan üç-dörd gün cəmi,
Düşmənin həmləsi var bura yenə.
Erməni tank ilə atdığı mərmi,
Son qoyur bir neçə ərin ömrünə.

Sadiqi Ənvərdi şəhidin biri,
Digəri Eldəniz, yüz nərə təndi.
Bu igid oğlunun şəhid xəbəri,
Matəmə bürüyüb bütün Daşkəndi.

Rəşadət Bərdədə xəstəxanada,
Çarpışır yarası sağalmaq üçün.
Bəd xəbər çatıbdı burda ona da,
Ağlayır dostuna o için-için.

Şəhidin yeddinci anım günündə,
Rəşadət izn alır baş həkimindən.
O şəhid dostunun qəbri önündə,
Ah çəkib ağlamaq keçir içindən.

Rəşadət bu igid, şəhid dostunun,
Məzarı üstünə yaralı gedir.
Dualar oxuyur ruhuna onun,
Baş əyir qəbrinə, ehtiram edir.

Üzündə göz yaşı, dözüb bir təhər,
Danışır, dillənir o aram-aram.
Söz verir, “Son nəfəs gələnə qədər,
Düşmənlə sənintək vuruşacağam.”

Adlayır o gündən bircə ay zaman,
Rəşadət hələki tam sağalmayıb.

Tələsir cəbhəyə, tələsir yaman,
Burada qalmağa səbri qalmayıb.

Eşidib taboru həminki yerdə,
Həminki postdadır, Ağdamdadırlar.
Həkimlər icazə verməsələr də,
Tezliklə getməyə veribdir qərar.

Evdədir hələ ki, bu günlər kəndə,
Bir qonaq gəlibdir Amerikadan.
O zaman qırxbeşdə dava bitəndə,
Qayıda bilməyib bu şəxs oradan.

Qohumlar, el-oba, bu kənd sevincdən,
Bir məclis qurubdu indi burada.
Xatirə olaraq o xoş məclisdən,
Video çəkdirir Rəşadət orda.

O vaxtdan bir həftə zaman keçincə,
Rəşadət qayıdır doğma tabora.
Deyir ki, "Düşməni məhv eyləyincə,
Bu tabor haraya, mən də ki, ora."

Beləcə üç ay da tobor burada,
Döyüşür əzmlə düşmənə qarşı.
Gərəkdi qalmasın heç zaman yada,
Bu ana vətənin bircə qarışı.

Adlayır noyabr, dekabr çatır,
Aylartək dəyişir bəzi qərarlar.
Komandir Əsədov bir əmr alır,
Tezliklə Murova qayıtsın onlar.

Qayıdır Murova Bərdə taboru,
Qayıdır döyüşə ən peşəkartək.
Qazana biləcək tabor uğuru?!
Ya nələr olacaq, gözləyək görək.

Kəlbəcər işğaldan qurtarsın deyə,
Plan var ortada, "Meydançay" adda.[1]
Tarixdə, yaddaşda çox qalsın deyə,
Çox yazan olacaq bu döyüş haqda.

Yeni il gəlməyə qalmış iki gün,
Başlayır bu döyüş, dekabr sonu.
Qar ilə örtülüb hər tərəf bütün,
Kəsməyir Murovun qarı, çovğunu.

Təpədən dırnağa silahlanaraq,
Yetişmək olacaq bəs, Kəlbəcərə?
Ümidlər çox böyük olsa da, ancaq,
Bu hücüm yanlışdır soyuğa görə.

Bu soyuq havada hücuma keçmək,
Cəsarət istəyir hər bir əsgərdən.
Çətindi yol-izi qar-buzdan seçmək,
Yıxılır, gah batır əsgərlər hərdən.

Beşinci taborda altı bölük var,
Hərəsi bir səmtə yol alacaqdır.
Kəlbəcər uğrunda bilməyir onlar,
Kim şəhid olacaq, kim qalacaqdır?

Bir aydan çox çəkən bu qanlı savaş,
Çox igid ömrünü sona yetirdi.
Kim isə qolunu, kim isə qardaş,
Kim isə ayağın, başın itirdi.

---

[1] 1993-cü ilin dekabr ayının sonu, 1994-cü ilin yanvar, fevral aylarında Kəlbəcərin işğaldan azad olunması üçün aparılan hərbi əməliyyat.

Sərt soyuq işləyir iliyə, qana,
Rəhm etmir burada heç kimə ruzgar.
Güllədən, mərmidən ölən bir yana,
Şaxtadan, soyuqdan donanlar da var.

İkinci bölükdə komandir Rizvan,[1]
On səkkiz yanvarda yaralanıbdır.
On doqquz yanvarda qardaşı olan,
Qulam da şəhidlik bil, qazanıbdır.[2]

Bizim də qəhrəman, igid Rəşadət,
Məhz həmin bölüyün bir əsgəridir.
Döyüşür düşmənlə ürəklə əlbət,
Dekabr sonundan üzü bəridir.

Bir gün də geridə qalmayıb hələ,
Qeyrəti lap önə çəkibdir onu.
Özündə yorğunluq hiss etsə belə,
Rəşadət dilinə almayıb bunu.

Bunu da mütləqdir mən deyim gərək,
Fərqlənir burada o çoxlarıyla.
Öndədir Rəşadət rabitəçitək.
Döyüşür həm də ki, avtomatıyla.

---

[1] Rizvan – 5-ci Bərdə taborunda 2-ci bölüyün komandiri Rizvan Qasımov.
[2] Qulam – 2-ci bölüyün minaatanı Qulam Qədirov.

İkinci aydır ki, gedir döyüşlər,
Bir neçə kəndləri alıb ordumuz.
Yaxında alına bilər Kəlbəcər,
Düşməni çətinə salıb ordumuz.

Amma ki, bu gediş dəyişir tamam,
Kəsilir o gündən uğurlu anlar.
Uğursuz döyüşlər verməyir aram,
Pozulur orada bütün planlar.

Kim qurub, kim edib deyildir bəlli,
Bilinən odur ki, xəyanət olub.
Nə zaman ordumuz gedib irəli,
Xəyanət ən böyük bir alət olub.

Xəyanət bu idi, gərəkli anda,
Arxadan hücuma olmayıb dəstək.
Taborlar, bölüklər hərə bir yanda,
Hədəfə düşüblər heyif ki, tək-tək.

Aradan ötsə də bu qədər zaman,
O anlar, olanlar yadda qalıbdı.
Tək elə Bərdənin bu taborundan,
Səksəndən çox əsgər şəhid olubdu.

Bu səksən şəhidin biri Rəşadət,
Onbiri fevralda son döyüş edib.
Bu vətən yolunda ona nəhayət,
Son olan bu döyüş Buzluğda gedib.[1]

[1] Buzluq – Kəlbəcər ərazisində 2390 metr hündürlükdə yerləşən dağ.

Bir neçə vaxtdı ki, elə burada,
Bölükdən bir tağım mövqe tutubdu.
Şaxtada dayanmaq çətin olsa da,
Bu tağım mövqedə sayıq durubdu.

Ürəkdən bağlıdı hər biri yurda,
Cürəti bu yurddan alıblar onlar.
Bir nəfər komandir olmaqla burda,
On altı döyüşçü olublar onlar.

Kəşfiyyat verdiyi xəbərə görə,
Düşmənin qüvvəsi çoxdu yaxında.
Tağımın durduğu elə bu yerə,
Gələ də bilərlər onlar bir anda.

Gecəyə yaxındır, elə bu zaman,
Anidən ətrafı sis-duman alır.
Görünməz olubdu bu anda hər yan,
Sis-duman tağımı təşvişə salır.

Dumanın olması gözlənməyirdi,
Gəlir də hamıya sirr təki bu iş.
Az öncə göydə ay gözə dəyirdi,
Elə bil dumanı düşmən gətirmiş.

Elə ki, sis-duman çəkilir bir az,
Düşmənin həmləsi başlayır o an.
Arada məsafə elə çox olmaz,
Atəşə tutublar sağdan, həm soldan.

O qədər gözlənməz başlayır döyüş,
Bir anlıq hər əsgər olubdu çaş-baş.
Gərəkdi yoluna tez düşsün bu iş,
Gərəkdi qalmasın heç kimdə təlaş.

Komandir əmr edir dərhal bölüyə,
Hər əsgər özünə tez mövqe tutsun.
Çəkilə bilmərik, yol yox geriyə,
Geriyə çıxışı hər kəs unutsun.

Döyüşə başlayır hamı bir anda,
Zamanı çox daha itirmək olmaz.
Gizlənib, yerləşib düşmən hər yanda,
Qüvvələr deyildir burada taraz.

Rəşadət tağımda rabitəçidir,
Həmdə ki, döyüşür bu an silahla.
Dörd yanı əlinə düşmən keçirdir,
İrəli can atır sağ-sol cinahla.

Tağımın düşdüyü bu məqam haqda,
Çalışır tabora versin məlumat.
Belə bir məqamda, belə bir vaxtda,
Tutmayır dalğanı, susur aparat.

Başlayır ərazi hey daralmağa,
Bu anda tağımda şəhid də çoxdu.
Əlavə hardansa kömək almağa,
İşə bax, başqa cür imkan da yoxdu.

Dayanmır bircə an, vermir ara da,
Yayınmaq olmayır “yağan” güllədən.
Görünən odur ki, artıq burada,
Çətindir çıxalar mühasirədən.

Düşmənin fikrindən hamı halıdır,
Əlbətdə heç kimə deyildir bu sirr.
Fərqi yox, kim ölüb, kim yaralıdır,
Çalışır hamını götürsün əsir.

Əsirlik ağırdı ölümdən betər,
Heç kimsə istəməz əsir düşməyə.
Döyüşə-döyüşə lap sona qədər,
Hazırdı burada hamı ölməyə.

Ümidi qalmayıb daha heç nəyə,
Yarası ağırdı, sağ qala çətin.
Düşmənə əsir tək düşməsin deyə,
Partladır özünü cəsur Əlǝddin.[1]

Var neçə yaralı, var neçə şəhid,
Sağ qalan az qalıb bu an döyüşdən.
Düşmənin özü də olubdu şahid,
İgidlər çəkinmir burda ölümdən.

Dumanlı, qaranlıq bu qış gecəsi,
Güllələr havada od, işıq saçır.
Duyulur, düşmənin öndə neçəsi,
Yaralı haldadı, arxaya qaçır.

[1] Əlǝddin – 5-ci taborun əsgəri Əlǝddin Ələkbərov.

O qədər çoxdu ki, bu azğın düşmən,
Azalmır bir an da döyüş səsləri.
Gülləyə tuş gələn düşmən tərəfdən,
Gəlir də rusların söyüş səsləri.

Demək ki, burada ermənilərlə,
Döyüşür işğalçı rus əsgərləri.
Yoxsa ki, bu qədər aylar, illərlə,
Döyüşə bilməzlər bizlə özləri.

Boşalan silahı doldurub yenə,
Mövqedə inamla durur Rəşadət.
Güllələr yağdırır azğın düşmənə,
Düşməni hücumda vurur Rəşadət.

Yaralı, şəhid var indi dörd yanda,
Rəşadət qalıbdı al-qan içində.
İstəyir taborla yenə bu anda,
Əlaqə yaratsın rabitəsində.

Bu anda düşmənin onu izləyən,
Bir atəş açılır snayperindən.
Efirə çıxmağa cəhd eyləyərkən,
Vurulur Rəşadət düz ürəyindən.

Bu həyat vermişdi ona sevgiyi,
Heyf ki, tükəndi ona bu həyat.
Canından, qanından lap çox sevdiyi,
Torpağın üstünə yıxılır heyhat!

Döyüşən qalmayıb artıq tağımda,
Gəlməyir səsləri, susub silahlar.
Bu vətən uğrunda, torpaq uğrunda,
Şəhidlik qazanıb bütün uşaqlar.

Gecədir, olubdur saat indi bir,
Dayanır döyüş tam, atışma kəsir.
Salamat qalıbdı təkcə "komandir",
Onu da düşmənlər götürür "əsir".[1]

Arxada qoysaq da vaxtı, vədəni,
Bu itki yaddaşdan itmir, silinmir.
O on beş igidin cansız bədəni,
Harada qalıbdı, yeri bilinmir.

Məzarı olmayan bu igidlərin,
Adları yaşayır hey dilimizdə.
Yurd üçün can verən Rəşadətlərin,
Yeri var hər zaman bu qəlbimizdə.

*Yeni Daşkənd, (27–31).08.2023*

---

[1] Son döyüşdən bir ay öncə tabora göndərilmiş, komandirlik bacarığı olmayan, "Baba" ləqəbli, sağ qalması təəccüblü olan, əslən İranlı Məhəmmədəli Əmir İbrahimi nəzərdə tutulur. Bir müddət sonra həmin İranlı ermənilər tərəfindən sərbəst buraxılmışdır.

**Sərraf Şiruyə**
*Azərbaycan Yazıçılar Birliyinin və*
*Azərbaycan Jurnalistlər Birliyinin üzvü*
*“Qızıl Qələm”, “Məmməd Araz” və*
*“H.B.Zərdabi” mükafatları laureatı*

## BU ELDƏN ŞƏHİD GEDİB

Bu eldən şəhid gedib,
Hər biri bir nər idi.
Bu eldən şəhid gedib,
Hər biri bir ər idi.

Bu eldən igid gedib,
Cəmi igidlər gözü.
Babası Qasım kişi
Düşmənə sərtlik üzü.

Ziyafəti görənlər,
Budur Beyrək dedilər.
Vuruşunu görənlər,
Əgrək, Səgrək dedilər.

Eldən Eldəniz gedib,
Dəli hünər Qantural.
Dağ kəlini boğduğu,
Həqiqətmiş bu xəyal.

Bu eldən Cəfər gedib,
Düşmənə qanlı bıçaq.
Vətənə, xalqa bağlı,
Həm kamallı, həm qoçaq.

Bu eldən Mehdi gedib,
Cəsur, qorxmaz, yenilməz.
Babası Hacı Rəhim tək
Yüz düşmənə əyilməz.

Bu eldən Ziya gedib.
Dəli Domrul hünərdə.
Əzrayılla güləşib,
Yerdə, göydə, səngərdə.

Bu eldən Qulam gedib,
Aruz oğlu Basat xan.
Gündə üç adam yeyən,
Təpəgözdən alıb qan.

Şir Şəmsəddin ürəkli,
Firudin gedib əldən.
Basat, Bəkil ürəkli,
Firudin gedib əldən.

Eldən Rəşadət gedib,
Hünər, qeyrət rəmzidir.
Eldən Rəşadət gedib,
Bir cəsarət rəmzidir.

Elçinin yerişinə,
Dəli vuran dedilər.
Meydana girişinə,
Salur Qazan dedilər.

Məhərrəm gedib eldən,
Qəlbi bəbir, ürəkli.
Məhərrəm gedib eldən,
Zəfər, hünər diləkli.

Rəsul gedibdir eldən,
Arzuları tər qönçə,
Olmayıbdı imkanı,
Sevgi sözü dilində.

Vətəndən qəbirləri,
Qərib düşən igidlər.
Rəşid ilə düşmənin
Bağrın dələn igidlər.

Gedibdir Ələsgər tək,
Bizə şöhrət, şan eylər.
Kəlbəcər həsrətiylə,
Kəlbəcərdə qan eylər.

Bilinmədi, nə oldu
Daşqın düşdü daşqına.
Bir çəkilməz dərd oldu,
Vətənindən qaçqına.

Elşən də Daşqın yollu,
Elşən də bəd taleli,
Yas donuna büründü,
Qaçqın oldu bir elli.

## ŞƏHİD QƏBİRLƏRİ

Al-əlvan çiçəklər, qırmızı lentlər,
Burda bəzəyibdi cansız daşları.
Burda cərgələnib ərgən igidlər,
Yatır bu millətin qan qardaşları.

Hər məzar, başdaşı bir ünvan verir,
Hər mərmər başdaşı alboma dönüb.
Baxıram, baxıram yaram qan verir,
Bir gör neçə-neçə ocaqlar sönüb.

Dağ boyda qüdrəti olan igidlər,
Necə də sığışıb bir dar məzara.
Hünəri tarixdə qalan igidlər,
Yetməyib bu günkü xoş arzulara.

Hər elin-obanın məzarıstanı,
Şəhid qəbirlərlə məbədlənibdi.
Neçə anaların ümid-gümanı,
Üz çevirib bu məbədə gəlibdi.

Bax bu da bir elin məzarıstanı,
Bu da cərgələnən igid şəhidlər.
Mən deyim onları sən bir-bir tanı,
Gör nələr söyləmir bu xatirələr.

Qayıtdı Yasifin nişan üzüyü,
Bağlı boxçadadı o vaxtdan bəri.
Bax budur, bax budur dərdin böyüyü,
O vaxtdan qurumur ana gözləri.

Şəhid cərgəsinin başında durub,
Od içində qalan polis Ziyafət.
Görən hansı qızdı boynunu burub,
Hansı bir ürəkdə susdu məhəbbət.

Aylar illər keçir, bu müşgül sual,
Bir düyünə dönüb açılmır hələ.
Bəlkə açılsaydı bu şirin xəyal,
Təsəlli olardı böyük bir elə.

Bu da ellər oğlu nər Eldənizdi,
Arşın oğlu dirək soy kökündəndir.
Dağ kəlini yıxan ər Eldənizdi,
Polad ürək, bilək soy-kökündəndir.

Taleyi qaralı kapitan Cəfər,
Qaldı tarixlərdə adın, hünərin.
Olmadı nə anan, nə atan, Cəfər,
Can deyib ağladı səni ellərin.

Qar-boranda qalan yaralı Ziya,
Ellər söhbət açır cəsarətindən.
Cəsəti elindən aralı Ziya,
Atan da köç etdi bu həsrətindən.

Ay böyük amallı «balaca» Qulam,
Neçə tanklar yıxdı qrantamyotun.
Adın çəkildikcə el deyir: – Balam,
Oyanın, təzədən nişangah tutun.

Bax bu da Firudin – qələm-qaş oğlan,
Vətənə canını qurban eylədi.
Döşünə sıxdığı avtomatıyla,
Düşmənin bağrını al-qan eylədi.

Bu da nur çöhrəli Elçinin qəbri,
Budur görüşünə gəlib bir gəlin.
Necə böyük imiş qəzanın cəbri,
Ayırdı sevgidən sevginin əlin.

İki məzar yeri boş qalıb burda,
Kaş güman gülləri ləçəklənəydi.
Müjdəçi gələydi bir gün bu yurda,
Hicranlı könüllər çiçəklənəydi.

İtgin Rəşadət, itgin Mehdimiz,
Qayıdıb gələydi doğma vətənə.
Tanrıya xoş gələ kaşki əhdimiz,
Şükürlər edəydik biz dönə-dönə.

Bu da Məhərrəmin bəzənmiş qəbri,
Oğul, qız əliylə bəzədilibdi.
Bu dərdə dözmədi atanın səbri,
Axirət evinə o da gəlibdi.

Bax bu da Rəsul, bu da son şəhid,
Bu da on ikinci, sayımın sonu.
Cəsus əməlləri vurdu bir kilid,
Metroda partlayış apardı onu.

Yenə bir-bir baxıb vidalaşıram,
Ziyarət edirəm bu qəbirləri.
Qəlbi dərdli-dərdli uzaqlaşıram,
Hələ gəzməliyəm neçə elləri.

Bu da qaçqın düşən Göyçə Daşkəndi,
Bakı şəhərindən başqa on səkkiz,
Rayonlar bölübdü həmən bu kəndi,
İndi hansı yana üz çevirək biz?

Hansının qəbrini harda axtaraq?
Fəxri xiyabanda, ya bölgələrdə...
Hansı qəbristandan biz tutaq soraq,
Yox, yox onlar deyil yad ölkələrdə.

Bu vətən uğrunda şəhid olublar,
Vətənə şöhrətdi qəbirləri də.
Hər biri yenilməz igid olublar,
Tarixə yazılıb hünərləri də.

Fəxri xiyabanda Tofiq uyuyub,
Soyadı Qocaman, Əsədxan oğlu.
Yaddaşlarda böyük bir hikmət qoyub,
Vətən ilə şərik ürək, can oğlu.

Abbası Samuxda ziyarət etdik,
Abbas Talıb oğlu – babası Qasım.
Bir hünər dalınca yol alıb getdik,
İgid babasına çəkmiş Abbasım.

Göyçənin ikinci qaçqınlığında,
Hünərlər göstərmiş Məşədi Qasım.
Ağdamın Əsgəran yaxınlığında,
Düşməndən çox qırmış Məşədi Qasım.

Bakının Şəhidlər xiyabanında,
Uyuyub Nurəddin Əmirxan oğlu.
Göyçə həsrətini hər an canında,
Yaşadıb kamalda pir insan oğlu.

Arzusu, istəyi bağlı bir boxça,
Sevgisi qönçəkən açmamış solub.
Vətənə sevgisi hər şeydən uca,
Vətən uğrunda da o, şəhid olub.

Nəbiylə Quşçuda görüşürük biz,
Qəbir hər tərəfdən bürünüb gülə.
Bu məzar daşıyla öpüşürük biz,
Baxışlar bizləri tutubdu dilə.

Bax Nəbi Zeynalov yazılıb daşa,
Atası Surxay da köçüb dünyadan.
Burda ata, oğul verib baş-başa,
Sanki, dərs götürür oğul atadan.

Göyçənin ikinci qaçqınlığında,
Şəhidliyə yetib gör neçə nəfər.
Zamanın o vaxtkı çaşqınlığında,
Nələr eyləməyib erməni kafər.

Belinə bağlanıb qaynar samovar,
Belə şəhid olub bax, Aşıq Nəcəf.
Diri-diri basdırılıb uşaqlar,
Beş oğul ölümə qoyulub hədəf.

Şəmsəddin, Şəmistan, Mikayıl, Aslan,
Beşinci sonbeşik, körpə İsmayıl.
Söylənir bu sitəm hər zaman, hər an,
Eşit bu zülümü müsəlman, ayıl!

Beş oğul anası olan Gülüstan,
Bir də iki gəlin intihar etdi.
Belə etməliydi qeyrəti olan,
Onlar şəhidliyə bax belə yetdi...

Selikovun başın kəsən Hacı Rəhim,
Oğlu Əsədullah, kəndlisi Muxtar.
Şəhid olub, tükənibdi hünərim,
Hələ də çəkirik belə qəm-qübar.

Ölkədə elə bir el-oba yoxdur,
Orda şəhid qəbri olmaya, Allah!
Sənin hər qüdrətin, kərəmin çoxdur,
Elə et tər güllər solmaya, Allah!

## DÖNÜB İGİDLƏR

*Kəndimizin şəhidlərinə və itkinlərinə*

El yığılıb səcdəsinə gəlibdi,
Dinə bilmir, daşa dönüb igidlər.
Dünən sevinciydi, bu gün gözlərdə,
Qurumayan yaşa dönüb igidlər.

Bu sitəmi tarix, zaman deyəcək,
Bu hünərlə el özünü öyəcək.
Elə sanırıq ki, yenə gələcək,
Bir köçəri quşa dönüb igidlər.

Ziyafətim ildırım tək çaxardı,
Qulam baxışından alov yağardı.
Eldəniz, Məhərrəm dağlar yıxardı,
Bir xəyala, huşa dönüb igidlər.

Yasif, Firuddinə, Ziya, Mehdiyə
Ağlarıq Elçinə nər deyə-deyə.
Rəşadət hünəri yetdi mərdliyə,
Qoşa gedib, qoşa dönüb igidlər.

Yaddan çıxmayıbsız, ay Rəşid, Cəfər,
Qəzaydı siz gedən o ağır səfər.
Sərraf Şiruyəyəm, qəlbimdə qəhər,
Sanıram keçmişə dönüb igidlər.

## SİZƏ LAYLAY ÇƏKƏMMİRƏM

Qönçə-qönçə solanlarım,
Sizə laylay çəkəmmirəm.
Kəfəni qan olanlarım,
Sizə laylay çəkəmmirəm,
Siz yoxsunuz deyəmmirəm.

Qan qundaqlı qardaşlarım,
Həmdəmlərim, sirdaşlarım.
Ey təsəlli başdaşlarım,
Sizə laylay çəkəmmirəm,
Siz yoxsunuz deyəmmirəm.

Oğul gəzən gözlərə bax,
Bükülüb bel, solub dodaq,
Ey nur səpib sönən çıraq,
Sizə laylay çəkəmmirəm,
Siz yoxsunuz deyəmmirəm.

Bəy xonçası görməyənlər,
Sevgi saçı hörməyənlər,
Bağ becərib dərməyənlər,
Sizə laylay çəkəmmirəm,
Siz yoxsunuz deyəmmirəm.

Ey Yasifim, Ziyafətim,
Məhərrəmim güc-qüdrətim,
Firudinim, Rəşadətim,
Sizə laylay çəkəmmirəm,
Siz yoxsunuz deyəmmirəm.

Eldənizim bir pirhünər,
Qulam, Elçin ər oğlu, ər!
Mehdi, Ziya, Rəsul, Cəfər,
Sizə laylay çəkəmmirəm,
Siz yoxsunuz deyəmmirəm.

Üzü gülüb olmasın şən,
Nakam qoydu sizi düşmən,
Qaçqın Daşqın, Rəşad, Elşən,
Sizə laylay çəkəmmirəm,
Siz yoxsunuz deyəmmirəm.

Tükənməzdi ah-ünlərim,
Yada düşüb sürgünlərim,
Qəriblərim, itkinlərim,
Sizə laylay çəkəmmirəm,
Siz yoxsunuz deyəmmirəm.

**Aqşin Hacızadə**
*Qarabağ müharibəsi veteranı,*
*Ziyafət Balıyev adına Yeni Daşkənd*
*kənd folklor evinin bədii rəhbəri, şair*

## VƏDƏSİZ

*Kəndimizin şəhidləri və itkinlərinə*

Nə sirdir, İlahi yaratdığını
Talayır, dağıdır, çapır vədəsiz.
Tor qurur insanın ömür yoluna,
Ölüm kəməndini atır vədəsiz.

Budur məzarıstan, budur məzarlar,
Tarixdi bu şəhid, igid oğullar.
Bir kam almamışdı dünyadan bunlar,
Torpağın qatına batır vədəsiz.

Ziyafət Yasiflə düşünür burda,
Ziyanın məzarı hardadı, harda?
Rəşadət Mehdiylə qalıbdı darda,
Zaman qollarını çatır vədəsiz.

Firudin Qulamla bax, qoşa durub,
Eldəniz Elçinlə baş-başa durub,
Cəfər əcəl ilə yarışa durub,
Nakamdı, torpaqda yatır vədəsiz.

Məhərrəm olubdu dillər əzbəri,
Nə məsumdu bu ərlərin nəzəri.
Solubdu Rəsulun qönçə gülləri,
Ölüm yaxşıları tapır vədəsiz.

*24.04.1995*

## ON ALTI ŞƏHİDİN ALTISI YAŞID

*Poema Birinci Qarabağ müharibəsində qəhrəmancasına həlak olan on altı Yeni Daşkəndli ərənimizin əbədi ruhuna həsr olunmuşdur. Bu on altı şəhidin altısı bir sinifdə oxumuş həmyaşıdlar idi. Ruhları şad olsun.*

Vətəndi bu yurdun hər bir qarışı,
Vətəndi bu yurdun adi daşı da.
Bu vətən deyilən hər kiçik daşı,
Gərəkdir qorusun vətəndaşı da.

Ayırsan yaşamaz başı bədəndən,
Baş nəyə gərəkdir bədən yoxdusa?
Vətən də belədir, gərək biləsən,
Heç nədir bu millət vətən yoxdusa.

Savaşlar olubdu yüz illər öncə,
Tarixə düşübdü qurbanlarıyla.
Vaxt, zaman dəyişib, ötüb beləcə,
Vətən qorunubdu oğullarıyla.

Vətəni canından çox əziz sanıb,
Nə qədər igidlər, ərlər, ərənlər.
Əbədi, ölümsüz ömür qazanıb,
Özünü vətənə qurban edənlər.

Kiçik bir kəndidir Daşkənd yurdumun,[1]
Bu məkan olubdur dillər əzbəri.
Adını ucaldıb Milli Ordunun,
On altı şəhidi, çoxlu ərləri.

Özümə borc bilib, çox ehtiramla
Bu şəhid ərləri yad edim dedim.
Götürüb qələmi təblə, ilhamla,
Anaraq, ruhların şad edim dedim.

On altı şəhidin altısı yaşıd,
Oxumuş idilər eyni sinifdə.
Bu altı qəhrəman, bu altı şəhid,
On ili bir olmuş hər gün, hər həftə.

Atası, babası olub qəhrəman,
Qəhrəman olmaqmış onun da andı.
Drambon kəndində döyüşən zaman,[2]
İlk şəhid adını Yasif qazandı.[3]

---

[1] Bərdə rayonunun Yeni Daşkənd kəndi nəzərdə tutulur.
[2] Drambon – Ağdərə rayonunda kənd (indiki: Heyvalı).
[3] Yasif Fəzi oğlu Kərimov (1973–1992) – şəhid.

Çiynində rabitə qurğusu ilə,
Döyüşə lap öndə gedirmiş Mehdi.
Qələbə ümidi, arzusu ilə,
Qorxu nə, ölüm nə bilmirmiş Mehdi.[1]

Yaraşıb ömrünə Rəşadət adı,[2]
Hər adam yaraşmır qoyulan ada.
Rəşadət cəbhədən aralanmadı,
Başından, çiynindən yaralansa da.

Son döyüş anları çox qanlı olub,
Ziyanın Kəlbəcər döyüşlərində.[3]
Məzarsız ruhu da o vaxtdan qalıb,
Murovun əlçatmaz zirvələrində.

Səngərdən səngərə od saça-saça,
Düşmənə döyüşdə verməyib aman.
Olsa da Qulamım boyca balaca,[4]
Adına deyiblər “Milli Qəhrəman”.

Orduda çoxundan ucaydı boyu,
Hey önə qaçardı hər vaxt, hər vədə.
Yenicə olmuşdu Elçinin toyu,[5]
Şəhidlik qazandı o, Ağdərədə.

---

[1] Mehdi Əmirxan oğlu Məhərrəmov (1973–1993) – itkin, şəhid.
[2] Rəşadət Əli oğlu Piriyev (1973–1994) – itkin, şəhid.
[3] Ziya Elmar oğlu Quliyev (1973–1993) – itkin, şəhid.
[4] Qulam Əkbər oğlu Qədirov (1972–1994) – şəhid.
[5] Elçin Əlif oğlu Hüseynov (1973–1994) – şəhid.

Beləcə bu altı yaşıd igidlər,
Son nəfəs gəlincə vətən dedilər.
Düşmənlə döyüşdə göstərib hünər,
Canların vətənə qurban etdilər.

İndisə söz açım səkkiz şəhiddən,
Səkkizin biriydi polis Ziyafət.
Təltif olunmuşdu Ulu öndərdən,
Medalla, ölmündən az sonra fəqət.[1]

Artilleriya rəisi vəzifəsiylə,
Səngərdə olmuşdu hər axşam, səhər.
Düşmənin gülləsi, ya mərmisiylə,
Qorxmamış bir an da kapitan Cəfər.[2]

İgidlər, ərənlər yaranır tək-tək,
Hünərlə, qeyrətlə düşürlər dilə.
Bu gün də, sabah da öyünmək gərək,
Bu yurdun ər oğlu Firudin ilə.[3]

Eldəniz hamını salıb təşvişə,[4]
Ən ağır döyüşə özün yetirib.
İlk dəfə baltayla girib döyüşə,
Önündə üç düşmən girov gətirib.

---

[1] Ziyafət Qurban oğlu Balıyev (1965–1992) – şəhid, ölümündən sonra "Hərbi xidmətlərə görə" medalı ilə təltif olunmuşdur.
[2] Cəfər İsax oğlu Cəmilov (1958–1993) – şəhid.
[3] Firudin Əli oğlu Həsənov (1969–1994) – şəhid.
[4] Eldəniz Dəmir oğlu Nəzərov (1970–1993) – şəhid.

Ölümlə üz-üzə gəlib hər anda,
Neçə döyüşlərdən keçdi Məhərrəm.
Vətənin parçası olan Ağdamda,
Şəhidlik məqamın seçdi Məhərrəm.[1]

Oxumaq, elm almaq arzusu vardı,
Bütün arzuları vaxtsız da soldu.
Erməni terrorçu, vəhşi barbardı,
Rəsul da terrorun qurbanı oldu.[2]

O gecə qalmışdı hamı təşvişdə,
Yağılar şəhərə qəfil doldular.
Xocalı zülmündə, Rəşid döyüşdə,[3]
Ata da, ana da şəhid oldular.

Öz doğma elindən qaçqın olanda,
Könüllü getmişdi cəbhəyə onlar.
Şəhidlik qazandı vətən yolunda,
Həm Elşən,[4] həm Daşqın əmioğlular.[5]

---

[1] Məhərrəm Ənvər oğlu Əliyev (1965–1995) – şəhid.
[2] Rəsul Niftalı oğlu İlyasov (1975–1995) – metro partlayışında həlak olub.
[3] Rəşid Hüseyn oğlu Hüseynov (1962–1992) – Xocalı şəhidi.
[4] Elşən Şura oğlu Əliyev (1974–1997) – şəhid, Yeni Daşkənddə məskunlaşan Ağdərəli məcburi köçkün.
[5] Daşqın Bəşir oğlu Əliyev (1975–1997) – şəhid, Yeni Daşkənddə məskunlaşan Ağdərəli məcburi köçkün.

Həvəslə başlarkən müəllimliyə,
İşğalda qalmışdı evi, ocağı.
Ələsgər yollandı lap ön cəbhəyə,[1]
Qorumaq gərəkdi yurdu, torpağı.

Beləcə bu ərlər, bax bu oğullar,
Dedilər torpağa, hər daşa vətən.
Bu gün də oyanıb deyirlər onlar,
Biz şəhid olduq ki, sən yaşa vətən!
Sən yaşa Vətən!

*15.02.2018*

[1] Ələsgər Fərrux oğlu Şükürov (1965–1994) – şəhid, Yeni Daşkənddə məskunlaşan Kəlbəcərli məcburi köçkün.

## PİRİLƏR NƏSLİ

Göyçə mahalının Daşkənd kəndində yaşayan tayfalardan biri də Pirilər nəsli olmuşdur. Təxminən 2005-ci ildən başlayaraq Daşkənd və Yeni Daşkənd kəndində yaşayan nəsillər haqqında araşdırmalar aparır, ağsaqqallardan qeydlər götürür, onları sxematik tərtib edərək müxtəlif kitablarda çap etdirmişəm. Pirilər nəsli haqqında məlumatları əsasən Cavad və İlham Bayramquliyev qardaşlarından əldə etmişəm. Onlar da yazdıqlarını rəhmətliklər Murtuz Bayramquliyev və Ramazan Piriyevdən soruşub öyrəndiklərini söylədilər.

Deyilənlərdən belə məlum olur ki, Pirinin Kərbəlayi Mustafa, Bayraməli və Bayramqulu adlı üç oğlu olub.

– Pirinin böyük oğlu Kərbəlayi Mustafanın Cəmil, Bəsti, Məhəmməd və Əli;

– Pirinin ortancıl oğlu Bayraməlinin Kərim, Qoca, İsmayıl və bir qızı (qızın adını xatırlayan yoxdur. Ona sadəcə “Bayraməli qızı” deyirmişlər);

– Pirinin kiçik oğlu Bayramqulunun isə Xəlil, Əbil, Mehdi, Xanım, Qızyetər və Gülgəz adında övladları olmuşdur.

Biz yazılı mənbələrə də istinad edərək Pirilər nəsli haqqında daha dəqiq informasiya vermək məqsədilə Nazir Əhmədlinin 2017-ci ildə çap etdirdiyi “Göyçə mahalının kameral təsviri” (1831-ci və 1842-ci illər) kitabına baxsaq da nəsil haqqında heç bir məlumat tapa bilmədik. Həmin müəllifin 2021-ci ildə çap etdirdiyi “İrəvan əyalətinin kameral təsviri” (IV cild) kitabına da baxmağı vacib bildik. Kitabın Daşkənd kəndinə aid hissəsində Pirilər nəsli ilə

bağlı iki yerdə məlumata rast gəlinir. Kitabın 362-ci səhifəsində 1859-cu ilə aid kameral siyahıda yazılır:

*15.Piri Mustafa oğlu 50 y;*
*oğlanları: Mustafa 30 y; onun oğlu Cəmil 2 y;*
*Bayraməli 20 y; Bayramqulu 15 y (5/3).*

Buradan bu günə qədər bizə məlum olmayan bir neçə fakt aydın olur. Belə ki, siyahıya görə 1809-cu il təvəllüdlü Pirinin atasının adı Mustafa olub. Əsasən baba vəfat edəndən sonra onun adının nəvəyə qoyulmasından o da məlum olur ki, baba olan Mustafa 1829-cu ilə qədər vəfat edibmiş. 1829-cu ildə doğulan nəvə Mustafanın (Kərbəlayi Mustafa) 1857-ci ildə doğulan Cəmil adında oğlu da var. Pirinin digər oğlanları olan Bayraməli 1839-cu ildə, Bayramqulu isə 1844-cü ildə anadan olublar. 1859-cu ilin məlumatına görə bu ailədə 5 kişi, 3 qadın olub.

Siyahıyaalma zamanı təkrəqəmli ailə nömrəsindən (15) o da məlum olur ki, bu ailə 1859-cu ildən əvvəlki 1852-ci il kameralında qeydə alınmayıb. Belə çıxır ki, ailə 1852–1859-cu illər aralığında kənddə məskunlaşıblar. Bəzən olur ki, kameral təsvirlərdə katibin səhvindən unudulub yazılmayan ailələr olur. Belə səhvlərin sayı isə yox dərəcəsindədir.

Həmin kitabın 367-ci səhifəsində əvvəlki siyahıyaalmadan 14 il sonra aparılan 1873-cü ilə aid kameral siyahıda isə belə yazılır:

*17.15.Mustafa Piri oğlu 44 y;*
*oğlanları: Cəlil 18 y; Mə(hə)mməd 5 y;*
*qardaşları: Bayraməli 34 y; Bayramqulu 29 y (5/7).*

Buradan da nəsil haqqında bir neçə fakt aydın olur. Belə ki, yazılanlara görə artıq Piri vəfat edibdir. Məntiqlə o, 1859–1873-cü illər aralığında vəfat etmiş olur. Sual oluna

bilər ki, bəlkə harasa köç edibdir? Bu, inandırıcı deyil. Çünki ailənin digər üzvləri Daşkənddə yaşayır, hətta ailə bir az da çoxalıb. 1873-cü ilin məlumatına görə ailədə 5 kişi, 7 qadın var. Göyçə mahalında aparılan kameralların heç birində qadınlar qeydə alınmadığından onların yalnız sayı haqqında fikir söyləmək mümkündür. Bu ailə üçün bu dəfəki kameral təsvirə və qadınların say artımına görə deyə bilərik ki, artıq Bayraməli və Bayramqulu da ailəlidirlər. Hətta onların qız övladlarının da olmasını tam əminliklə söyləmək olar.

Əvvəldə qeyd etmişdik ki, 1829-cu ildə doğulan nəvə Mustafanın (Kərbəlayi Mustafa) 1857-ci ildə doğulan Cəmil adında oğlu var. İndi isə onun 1868-ci ildə doğulan Məhəmməd adlı daha bir oğlu da var. Ancaq burada bir yanlışlıq var və ona aydınlıq gətirilməsini vacib hesab edirik. 1859-cu ilə aid siyahıda Cəmilin 1857-ci ildə, 1873-cü ilə aid siyahıda isə Cəlilin 1855-ci ildə doğulduğunu görürük. Əvvəlki siyahıda Cəmil adı doğru, təvəllüd isə 2 il əksik yazılıbdır. Cəmil adı günümüzə qədər soyad şəklində gəlib çatdığından buna əminik. Sonrakı siyahıda olan Cəlil adını isə katibin bir hərif (m→l) səhv etdiyini düşünürük. Çünki, Cəlil adında Kərbəlayi Mustafanın övladının olduğunu bilən yoxdur. Burada digər versiyaları da mülahizə etmək olardı. Lakin, bunların doğruluq faizi çox aşağı olduğundan lüzum görmürük.

Yuxarıda yazdıqlarımızdan kameral təsvirlərin əhəmiyyəti çox aydın görünür. Rusiya imperiyası dövründə tərtib olunmuş və tədqiqatçı-alim Nazir Əhmədlinin elmi dövriyyəyə daxil etdiyi kameral təsvirlər bu cür şəcərələrin araşdırılmasında çox əhəmiyyətlidir.

Pirilər nəslinin üzvləri yaşadıqları ata-baba yurdlarından 1905-ci, 1919-cu, 1953-cü və 1988-ci ildə olmaqla dörd dəfə deportasiya olunublar. Onlar əsasən Bərdə rayonunun Yeni Daşkənd kəndində, Bakı şəhərində və az sayda respublikanın digər yaşayış məntəqələrində məskunlaşıblar.

Bu nəsildən İkinci Dünya müharibəsində, Əfqanıstan müharibəsində, Qarabağ müharibəsində iştirak edənlər olmuş, öz nümunəvi xidmətləri ilə fərqlənmişlər.

Kərbəlayi Mustafanın nəvəsi Mustafayev Hüseynqulu Cəmil oğlu, Bayraməlinin nəvələri Piriyev Məhərrəm Kərim oğlu, Piriyev Əsgər Kərim oğlu, Piriyev Mikayıl Qoca oğlu, Bayramqulunun nəvələri Piriyev Tapdıq Əbil oğlu, Piriyev Əli Əbil oğlu İkinci Dünya müharibəsində iştirak etmiş, veteran kimi doğulduqları Göyçə mahalının Daşkənd kəndinə qayıtmışlar.

Əfqanıstan müharibəsində Mehdinin nəvəsi Piriyev Şaban Yaqub oğlu, Əbilin nəticəsi Piriyev Qabil Qardaşxan oğlu iştirak etmiş, orden və medallarla təltif olunaraq doğulduqları Bərdə rayonunun Yeni Daşkənd kəndinə qayıtmışlar.

Qarabağ müharibəsində isə Pirilər nəslinin onlarla üzvü iştirak edərək Azərbaycanın ərazi bütövlüyü uğrunda döyüşlərdə fədakarlıq göstərmişlər. Onlardan Hüseynqulunun nəvəsi Cəmilov Cəfər İsaq oğlu (1958–1993), Əbilin nəvəsi Piriyev Rəşadət Əli oğlu (1973–1994) və Əbilin nəticəsi Həsənov Firudin Əli oğlu (1969–1994) şəhidlik zirvəsinə ucalmışdır.

**Araz Yaquboğlu**
*tədqiqatçı-jurnalist*

## PİRİLƏR


Mustafa
Piri
K.Mustafa
Bayraməli
Bayramqulu
Cəmil
Bəsti
Məhəmməd
Əli
Kərim
Qoca
İsmayıl
Qız
Xəlil
Əbil
Mehdi
Xanım
Qızyetər
Gülgəz


Mustafa
Piri
K. Mustafa
Cəmil
Hüseynqulu
Bəsti
Səkinə
Məhəmməd
Salatın
Əli
Məhərrəm
Bahadur
Vaqif
Tofiq
Arif
Akif


Mustafa
Piri
K. Mustafa
Cəmil
Hüseynqulu
Səkinə
Salatın
Məhərrəm
Röyzə
İsaq
Gülgəz
Gülşad
Qismət
Cəfər
Gülnaz
Sevil
Rəfail
Rəhilə


Mustafa
Piri
Bayraməli
Kərim
Günəş
Nənəş
Məhərrəm
Əsgər
Qoca
İsmayıl
Qız
Növrəstə
Mikayıl
Mehriban
Mahal


Mustafa
Piri
Bayraməli
Kərim
Günəş
Nənəş
Məhərrəm
Əsgər
Əli
Pürzə
Gülzar
Taquş
Tabəs
Həqiqət
Şahzadə
Əkbər
Oktay
Tahir
İbrahim
Mədinə
Sara
Rizvan
Emin
Elvin
Məzahim
İmmi
Həcər
Güləndam
Fəzair
Tofiq
Qətibə
Rafiq
Laçın


Mustafa
Piri
Bayraməli
Qoca
Mikayıl
Mahal
Mehriban
Möhübbət
Bərşad
Sahilə
Fatma
Sevda
Mikayıl
Fidana
Sevil
Faiq
Sevinc


Mustafa
Piri
Bayramqulu
Xəlil
Hüseyn
Bayaz
Tərgül
Teybə
Kəklik
Pusat
Əbil
Vəli
Tapdıq
Əli
Kövsər
Zeynəb
Gözəl
Mehdi
Murtuz
Xuraman
Yaqub
Nərgiz
Xanım
Qızyetər
Gülgəz


Mustafa
Piri
Bayramqulu
Əbil
Zeynəb
Kövsər
Gözəl
Tapdıq
Qardaşxan
Gülarə
Azadxan
Əli
Şahmurad
Tərcüman
Şahvələd
Şahsuvar
Rəşid
Mehriban
Rəşadət
Vəli
Yusif
Sanirə
Mahirə
Qənirə
Tahirə


Mustafa
Piri
Bayramqulu
Mehdi
Murtuz
Xuraman
Yaqub
Nərgiz
Sərdar
Qaçay
Cavad
İlham
Səba
Mələk
Sərvər
Şaban
Vəliyəddin
Seyfəddin
Tərlan
Seyfulla
Mehdi
Əfqan

# KƏRİMLƏR


Məhəmməd
Kərim
Sədət
Məhəmməd
İbrahim
Abdulla
Sədət
Qənimət
Bayram
Əvəz
Selyan
Sədət
Pəri
Fərhad
Səyyad
Ələsgər
Ələkbər
Əfqan
Tərbiyə
Mələksuma
Tamilə
Quba
Paklet
Dağbəyi
Ərzuman
Zaman
Hökümə
Pürzə


Məhəmməd
Kərim
Məhəmməd
Qənimət
Bayram
Əvəz
Selyan
Sədət
Pəri
Hesam
Məhəmməd
Əfsanə
Fərzanə
Rüqəyyə
Süraye
Hüseyn
Rahilə
Qadir
Sabir
Əhməd
Arifə
Fatimə
Zəhrə
Əsgər
Əkbər
Behzad
Röya
Mina

## ƏDƏBİYYAT


1. Süleyman Osmanoğlu. Dərdini bağırmaq istəyən adam. “Azadlıq” qəzeti, 13 may 1995-ci il, səh. 3
2. Qədir Aslan. Göyçə şəhidləri. Bakı, İşıq, 1997. səh. 192–193. // http://web2.anl.az:81/read/page.php?bibid=26796&pno=98
3. Mir Cəfər. Bərdə şəhidləri. Bakı, Sabah, 2005. səh. 253. // http://web2.anl.az:81/read/page.php?bibid=8495&pno=127
4. Səyyad Şairov. Yaralı Göyçə. Bakı, Nurlan, 2006. səh. 50–53
5. Qocaman Qocamanov. Göyçə mahalında, Daşkənd elində. Bakı, Nurlan, 2007. səh. 23.
6. Azərbaycan Respublikası Xatirə Kitabı, XII cild, O, Ö, P, R. Respublika Xatirə Kitabı Redaksiyası, Bakı, 2012. səh. 208.
7. Ruslan Xəlil. Azərbaycan rabitəsinin qurucuları və davamçıları. 17 avqust, 2012 // http://simsar.az/news/a-24478.html
8. Əkbər Mirzəzadə. Beşinci Bərdə taboru. (I kitab). Bakı, MTR Group, 2012. səh. 251–252
9. Araz Yaquboğlu. Daşkənddən Yeni Daşkəndə. Bakı, Elm və təhsil, 2023. səh. 265
10. Vikipediya, azad ensiklopediya // https://az.wikipedia.org/wiki/Rəşadət Piriyev
11. YouTube kanalı // https://www.youtube.com/watch?v=ZXgx6_kuuPE&t=801s

# MÜNDƏRİCAT



## Şəhid Rəşadət Piriyev haqqında yazılanlar



## Şəhid Rəşadət Piriyev xatirələrdə

## Yeni Daşkənd şəhidləri poeziyada



## Şəhid Rəşadət Piriyevin ata və ana tərəf şəcərəsi



Ruhun şad olsun, əziz sinif yoldaşım Rəşadət. Sən döyüşlərdə adına layiq rəşadət göstərərək rəşadətli Rəşadət adını qazandın.

Araz Yaquboğlu